философские, политические и юридические науки, культурология и искусствоведение. Вопросы теории и практики. № 8. Ч.3.Тамбов: Грамота, 2011. С. 44-47
54. Почекаев Ю.Р. Узурпаторы и самозванцы степных империй. История тюрко-монгольских государств в переворотах, мятежах и иноземных завоеваниях. СПб.: Евразия, 2016. 378 с.
55. Китайские документы и материалы по истории Восточного Туркестана, Средней Азии и Казахстана, XIV-XIX вв. Алматы: Гылым, 1994. 270, [1] с.
56. Atwill D. The Chinese sultanate. Islam, Ethnicity and the Pantay rebellion in South-West China, 1856-1873. Stanford: Stanford university press, 2005. 280 p.
57. Центральная Азия в составе Российской империи. СПб.: Новое литературное обозрение, 2008. 464 с.
58. Ануфриев К.С. Политика России и Китая в Центральной Азии: опыт сравнительно-исторического анализа // Автореферат диссертации на соискание ученой степени доктора исторических наук. Специальность 07.00.03. Всемирная история. Томск: Томский политехнический университет, 2010. – 37 с.
59. Обзор архивных и других исторических документов XIX века по истории кыргызского народа (в эпоху Ормона-хана). http://beshbarmak.info/files/kitepkana/Bizdinkg/ormonxaninarchievematerials.pdf

## Qırğızlar və uyğurlar böyük dövlətlər arasında (1760-1881)

### Xülasə

Bu məqalə Rusiya imperiyasının qırğız və uyğurlarla münasibətlərinə həsr edilmişdir. XIX əsrin birinci yarısındakı Uyğur üsyanları Kokand xanlığının təstəyi ilə qarşılaşdı. Ömər xan və Mədəli xan birbaşa Uyğur üsyançılarına kömək etdilər və Belogorsk Xocasını mühasirəyə aldılar. Xocaları və qırğızları dəstəklədilər. 19-cu əsrdə Tzin imperiyası fəal hücum siyasətindən müdafiəyə keçdi və 1930-cu illərin Kokand xanlığı tərəfindən tətbiq olunan ticarət müqaviləsi ilə barışmaq məcburiyyətində qaldı. XIX əsrdə Müqavilə bağlandıqdan sonra Kokand qoşunları artıq birbaşa Qinq imperiyasının ərazilərinə basqın etdilər. Kokandanlar öz ərazilərində uyğur qaçqınlarını qəbul etməklə məhdudlaşdılar və xocaları təqib etmədilər. 60-cı illərin üsyanı XIX əsr Kokan xanlığından olan könüllülərin köməyi ilə xanın özünün fəal iştirakı olmadan həyata keçirilmişdir. Yaqub-bəy Böyük Britaniya tərəfindən fəal şəkildə dəstəkləndi, Rusiya İmperiyası onunla birbaşa mübahisə etmədi və Osmanlı İmperatorluğu uyğurlara bacardıqlarından daha az kömək etdi. Uyğurların başçılığı ilə Yaqub bəy Sincan ərazisində yaranan bir sıra müsəlman dövlətlərini alt-üst etdi və ruslar buna mane olmadı. Rusiya İmperiyası üçün xüsusi maraq Iliyalı uyğur sultanın ilhaqı idi. Onun işğalı uyğurların ruslara qarşı düşmən münasibəti və Yaqub bəy tərəfindən bu dövlətin ilhaq edilməsi təhlükəsi ilə əsaslandırıldı. Tzuo Tzuntanın Sincanda etdiyi kampaniya zamanı ruslar müdaxilə etməmək siyasətini tətbiq etdilər. Əsas Uyğur ərazilərinin geri qaytarılmasından sonra Tzin imperiyası rusları Kuldzhinsky (Iliysky) bölgəsini geri qaytarmağa məcbur etdi. Qırğızlara gəldikdə, Rusiya İmperiyası qazaxlara və Kokand xanlığına qarşı onları himayə etmək siyasətinə sahib idi. 40-cı illərdə. XIX əsr Rus qoşunları qırğızlara yalnız diplomatik yardım göstərməklə kifayətləndi.

## Kyrgyz and uyghurs between great power (1760-1881)

### Summary

This paper is devoted to the analysis of the policy of the Russian Empire in relation to the Kyrgyzes and Uighurs. During the research it is important to show the role of the Kokand khanate in the history of Central Asia in the nineteenth century. Uighur Revolts of the first half of the XIX century. They met with assistance from Kokand khanate. Umar-Khan and Madali-Khan directly assisted the Uighurs who rebelled and sheltered the White Mountain Khwajas. Kyrgyzes helped ti Khwajas. The Qing Empire in the XIX century moved from active offensive policy to deaf defense and was forced to reconcile with the imposed by the Kokand Khanate trade agreement of the 30-ies years of XIX century. After the conclusion of the treaty, the Kokand troops didn't directly invade the lands of the Qing Empire more. The Kokand residents limited themselves to accepting Uighur refugees on their lands and didn't pursue khwajas. Muslim revolt of the 60-ies years of XIX century in Xinjiang Was carried out with the help of volunteers from the Kokand khanate without the active participation of the khan. Yakub-bek enjoyed active assistance from the Great Britain, the Russian Empire did not directly oppose him, and the Ottoman Empire rendered the Uighurs much less than they could help. Yakub-bek headed by Uighurs subordinated a number of Muslim states emerged in the territory of Xinjang and the Russians didn't interfere with it. Particular interest of Russian Empire was the

annexation of the Ili Uighurian Sultanate. His occupation was justified by the hostile attitude of the Uighurs towards the Russians and the danger of the annexation of this state by Yakub-bek. During the campaign of Zuo Zongtang to Xinjiang, the Russians adopted a policy of non-intervention. After the return of the main Uighur territories, the Qing empire forced the Russians to give up the Qulzha (Ili) region. Concerning the Kyrgyz, the Russian Empire had a policy of protecting them against the Kazakhs and Kokand khanate. Russian troops didn't direct support the Kyrgyzes, Russian Empire suppory them only diplomatic assistance in the 40-ies years of XIX century. The Kyrgyzes turned out to be an effective tool in the fight against the rebels of the Kazakh Khan Kenesary Kasimuly. The Russian empire rendered diplomatic assistance to the Kyrgyz manapas by accepting a tribe for the tribe in the 50-ies and 60-ies years of XIX century. Russians defeating the troops the Kokand troops indirectly supported the Kyrgyz tribes that were oppositional to the Kokand Khanate. The revolts of the Kyrgyzes in the 70-ies years of XIX century were directed against khan Khudoyar, who became a Russian vassal in 1868 year. The revolts of the Kyrgyz in 1875-1876 years was used by Russians as an excuse for the elimination of the Kokand Khanate. Alay and Pamir Kyrgyz entered the Russian Empire last.

Göndərilib: 02.07.2020 Qəbul edilib: 05.07.2020

DOI: 10.36719/AEM/2007-2020/55/42-46

**Xalidə Qələndər qızı İsmayılova**
Bakı, Azərbaycan

# XƏTAİ İRSİ: DÖVLƏTÇİLİK İŞİNİN TARİXİ ƏSASLARI

***Açar sözlər**: şah, Xətai, dövlət, dövlətçilik, Səfəvi, ölkə, cəmiyyət, şəxsiyyət, məğlubiyyət, sülalə, qılınc, tarix, qələbə, söz-şeir*
***Key words:** shah, Khatai, state, statehood, Safavid, country, society, personality, defeat, dynasty, sword, history, victory, word-poem*
***Ключевые слова**: шах, Хатаи, государство, государственность, Сефевид, страна, общество, личность, поражение, династия, меч, история, победа, слово-поэма*

Tarixə rakurs: Bildiyimiz kimi, Şah İsmayıl Səfəvi (I İsmayıl və ya Şah İsmayıl (tam adı: Əbül-Müzəffər İsmail ibn Heydər əs-Səfəvi; 17 iyul 1487-ci il, Ərdəbil, 23 may 1524, Ağqoyunlu - Sərab) Səfəvilər dövləti - Səfəviyyə təriqətinin şeyxi, Səfəvilər dövlətinin banisi və ilk şahı kim tarixə düşmüşdür. Onun yaratdığı Səfəvilər dövləti 1736-cı ilə qədər mövcud olmuş, Xətai 1501-ci ildən Cənubi Azərbaycanda On iki imam şiəliyinə əsaslanan Səfəviliyi yayaraq 1509-cu ildə bütün İran, Azərbaycan, İraq, Şərqi Anadolu və s. əraziləri vahid dövlətdə birləşdirmişdir.

Tarixdən bilirik ki, I Şah İsmayılın altıncı əcdadı, mərkəzi Ərdəbildə yerləşən Səfəviyyə sufi təriqətinin əsasını qoymuş Şeyx Səfiəddin İshaqdır (1252-1334). Bir sıra Səfəvi mənbələri Səfəvi əcdadlarının tarixçəsini Şeyx Səfiəddinin yeddinci əcdadı olmuş və XI əsrdə yaşadığı güman edilən Firuzşah Zərrinkülaha bağlayırlar və onun yeddinci şiə imamı Musa əl-Kazımın nəslindən gəldiyini bildirirlər. Lakin araşdırmalar nəticəsində belə bir fikir də irəli sürülmüşdür ki, Firuzşahı İmam Musa əl-Kazım vasitəsilə peyğəmbər və imam nəslinə bağlamaq cəhdi Səfəvilər sülaləsinin hökmranlıqlarının legitimliyini əsaslandırmaq məqsədi güdmüşdür. Həmçinin, tarixşünaslıqda Səfəvi əcdadlarını qeyri-türk entoslarla əlaqələndirmək üçün müəyyən cəhdlər də edilmiş, Firuzşahın Cənubi Ərəbistandan (Yəməndən) və hətta Fars vilayətindən köçərək, Azərbaycanın Ərdəbil nahiyəsinə gəldiyi barədə iddialar ortaya atılmışdır. Lakin tədqiqatlar dərinləşdikcə bir sıra yerli və əcnəbi alimlər Səfəvi əcdadlarının türk mənşəli olduqlarını təkzibedilməz dəlillərlə təsbit etmişlər. Bu da o anlama gəlir ki, Səfəvi sülaləsinin kökü Azərbaycan ailələrindən ibarət olmuşdur. V.V.Bartold Səfəvilər sülaləsinin türk mənşəli olduğunu qeyd edərək yazırdı ki, *"Ərdəbil şeyxləri, şübhəsiz, fars mənşəli deyil, Türk mənşəli idilər"*. İ.P.Petruşevski də bu analoji fikirdə olub, Səfəvilər sülaləsinin əslən Cənubi Azərbaycandan, Ərdəbildən olduğunu, Səfəviyyə sufi - dərviş təriqətinin irsi şeyxləri olduğunu yazırdı və əlavə edirdi ki, *"ilk Səfəvi şeyxləri Ərdəbildə yaşayırdı, onların doğma dili Azərbaycan dili idi"*. Sufizmin fransız tədqiqatçısı Massinyon Səfəviyyə təriqətinin "Suxravərdiyyə dərviş ordeninin Azərbaycan qolu" olduğunu yazırdı...

Nəsil-nəcabəti Azərbaycançılıq ideyalarına sadiq kök üstündə qurulmuş Şah İsmayıl Səfəvi 1487-ci il iyulun 17-də nüfuzlu azərbaycanlı ailəsində doğulmuşdur. Ata tərəfdən Şeyx Səfiəddinin nəslindən olan İsmayılın atası Şeyx Heydər, babası Şeyx Cüneyd, anası Aləmşah bəyim Ağqoyunlu hökmdarı Uzun Həsənin qızı, Sultan Yaqubun bacısı olmuşdur. Şah İsmayılın iyirmi beşinci babası Əbülqasım Həmzənin, on beşinci babası Qızılbörk Firuzun qəbirləri Ərdəbil yaxınlığındakı Şeyx-Kəhrəlan kəndində indi də durur. Yerli əhali bu qəbirləri ziyarətgaha çevirib. Bütün bunlar İsmayılın, onun soy-kökünün Azərbaycan vahidində bərqərar olmasını birmənalı şərtləndirir...

Tarixi əsaslara söykənərək belə bir müddəa irəli sürə bilərik ki, İsmayılın siyasi hakimiyyətə gətirilməsinə əsasən Şirvanşah qoşunu ilə döyüşdə qızılbaşların məğlub olması, Şeyx Heydərin öldürülməsi olmuşdur. Bilirik ki, 9 iyul 1488-ci ildə Tabasaranda Şirvanşah qoşunu qızılbaşlara divan tutmuş, Səfəvi hakimiyyəti əməlli-başlı laxlamışdı. Şeyx Heydərin ölümündən sonra İsmayıl, anası və qardaşları Sultan Əli və İbrahim Sultan Yaqub tərəfindən əvvəl monastır kimi tanınan Akdamar qalasında, sonra Şiraz yaxınlığındakı İstəxr qalasında 5 il həbsdə saxlanılmış, Uzun Həsənin nəvəsi Sultan Rüstəm Səfəvilərdən istifadə etmək məqsədi ilə onları həbsdən azad etdirib Ərdəbilə qaytarmışdır. O vaxt Şeyx Heydərin böyük oğlu Sultan Əli atasının işini davam etdirirdi və həlak olmazdan əvvəl qardaşı İsmayılı təriqət şeyxi vəzifəsinə varis təyin etmişdi.

İsmayılın qardaşı Sultan Əlinin və Sultan Rüstəmin birləşmiş qüvvələri 1493-cü ildə Baysunquru məğlub etmiş, Sultan Rüstəm Səfəvilərə qarşı siyasətini dəyişmişdi. Bu minvalda Ərdəbil yaxınlığındakı Şəməsi döyüşündə Şeyx Sultan Əli məğlub edilmiş və öldürülmüşdü. Onun ölümündən sonra sufilər İsmayıl və qardaşı İbrahimi Ərdəbildə gizlətməyə müvəffəq olmuşdular. Heydərin oğlanlarını hər vasitə ilə tutmaq və məhv etmək tapşırığını almış Eybə Sultanın dəstələri şəhərə daxil olanda Səfəvilər sülaləsinin gələcək

hökmdarı İsmayılın ələ keçməməsi üçün dualar edilmişdir. Bu ərəfdə İsmayıl Şeyx Səfiəddin məqbərəsindən Qazi Əhməd Kakuli adlı səfəvi müridlərindən birinin evinə aparılmış və üç gün burada qaldıqdan sonra yeddi yaşında Xancan adlı qadının himayəsinə verilmişdir... Elə bu yaşından başlayaraq İsmayılda kəskin intiqam hissi baş qaldırmış, atasını, sülaləsini məhv etmiş Şirvan şahına qarşı döyüş planları barədə düşünmüşdür. Beləliklə, çox erkən yaşında əlinə qılınc almış İsmayılın ətrafında Azərbaycandan Kiçik Asiyaya keçənə qədər şamlı, rumlu, ustaclı, zülqədər, qacar, əfşar tayfalarından, Qaradağ sufilərindən ibarət 7000 qazi toplanmışdır.

1499-cu ilin avqust ayında 12 yaşlı İsmayıl özünün yaxın tərbiyəçisi və məsləhətçisi olan bir neçə qızılbaş tayfa başçısı ilə birlikdə qoşun toplamaq üçün Ərdəbilə yollanmış, ancaq şəhər hakimi tərəfindən təqib olunmuş, buna görə o, 1500-cü ilin yazında Şamlı və Rumlu tayfalarından, habelə Qaradağ və Talış əhalisindən ona qoşulmuş 2 minə yaxın qızılbaşla Qarabağ, Çuxursəd, Şuragil, Kağızman, Tərcan yolu ilə Ərzincana gəlmişdir. Yeniyetmə yaşlarından qüdrətli dövlət yaratmaq iddiaları ilə qılınca sarılmış İsmayılın içindəki intiqam hissi daha da alovlanmış, onun Şirvana boylanan baxışlarında daim fırtına görünmüşdür...

Tarixi mənbələrdən bilirik ki, İsmayıl, apardığı bütün döyüşlərdə öz yaşına görə qeyri-adi dərəcədə sərkərdəlik qabiliyyəti və şəxsi igidlik nümunəsi göstərmiş, 1501-ci ilin payızında Təbrizə daxil olaraq özünü şah elan edən bu tarixi şəxsiyyət Azərbaycan Səfəvilər dövlətinin əsasını qoymuş, Təbrizi bu dövlətin paytaxtı etmişdir.

Şah İsmayılın ağlı və səmərəli siyasi fəaliyyəti həmişə diqqət çəkib. Onun özbək Şeybani xana qarşı manevrləri də bu barədə dolğun fikir əxz edir. Məsələn, Şeybani İsmayıl üçün strateji əhəmiyyət daşıyan İsfahanı tutarkən ona göndərdiyi *"Mən İran və Azərbaycan sərhədlərinə gələrək, oranı tutandan sonra İraqi-Ərəbə və Hicaza gedəcəyəm"* məktubana cavab olaraq Şah İsmayıl öz qoşunlarını Xorasana yeridib. Şeybani xan Mərv qalasında gizlənib, lakin İsmayıl aldadıcı manevr edərək, onu qaladan bayıra çıxarıb və 1510-cu ilin 2 dekabrında Mahmudi kəndi yaxınlığında Şah İsmayılla Şeybani xanın qoşunları arasındakı Mərv döyüşü Şah İsmayılın tam qələbəsi ilə başa çatıb.

Şah İsmayılın apardığı strateji dövlətçilik siyasəti sayəsində Səfəvilər dövləti Yaxın Şərqin qüdrətli dövlətlərindən birinə çevrlmiş, Səfəvi dövləti öz yüksəlişinin zirvə nöqtəsinə qalxmış, onun ərazisi 2 milyon 800 min kvadrat kilometrə çatmışdır.

Şah İsmayıl fiziki cəhətdən çox güclü sərkərdə olmuşdur. Tarixdə baş vermiş bir hadisə onun qollarındakı gücü belə təsvir edir: *«Şah İsmayıl Çaldıran döyüşündə topları bir-birinə bağlayan zəncirləri kəsərkən bir anda onun qüvvətli zərbəsi topun lüləsini iki yerə bölür. Çaldıran döyüşündən uzun müddət sonra Sultan Səlim Şah İsmayıldan həmin qılıncı ona göndərməsini istəyir. Şah həmin qılıncı Sultana göndərir. Sultan Səlim neçə dəfə cəhd göstərsə də topu kəsə bilmir. O, Şaha məktubunda deyir: "Sən məni aldadırsan, bu, həmin qılınc deyil". Şah İsmayıl cavab məktubunda ona belə cavab verir: "Qılınc həmin qılıncdır, qol o qol deyil".*

Şah İsmayılın gücü, qüvvəsi, dövlətçilik siyasəti barədə deyilənlər də bu barədə əsaslı mühakimə yürüdür. Məsələn, Abbasqulu ağa Bakıxanov yazırdı: *«İsmayıl öz dövrünə görə mükəmməl təhsil görmüşdü. Bu yaşda ən qanlı boğuşmalardan qalib çıxmışdır. Çox gözəl bir döyüşçü, hədəfi dəqiq vuran ovçudur. Mağarada yaşayan və insanlara hücum edən nəhəng bir ayını oxla vurub öldürəcək qədər qüvvətli və cəsarətlidir...».* Görkəmli yazıçı Fərman Kərimzadənin fikrincə, *«Bu şəxsiyyət yüksək elmilik, sadə xalqa yaxınlığı ilə seçilir. Şah ismayıl Səfəvi siyasət sahəsində olduğu kimi, ədəbiyyat sahəsində də elmiliyi ilə xüsusi seçilən bir dahi kimi qəbul edilə bilər».* Xalq yazıçısı Əzizə Cəfərzadənin qənaətincə, *«Hər bir addımında diqqətli, ehtiyatlı olan Şah İsmayıl ağıllı məsləhətlərə də qulaq asır, əqidə, məslək yolunda sədaqətlə hərəkət edirdi...».* Akademik Ramiz Mehdiyev yazır: *«Şah İsmayılın apardığı müharibələr onun vahid Azərbaycan dövləti yaratmaq arzu və istəyindən irəli gəlirdi. O, Azərbaycan dilini dövlət və şeir dilinə çevirmiş, ölkənin siyasi, ictimai, iqtisadi və mədəni inkişafı üçün ölçüyəgəlməzdərəcədə böyük işlər görmüşdür».* Övliya Çələbinin fikrinə əsasən, *«Şah İsmayıl həm də məğrur, azad fikirli,öz qüdrətinə inanan bir sərkərdə, həqiqət yolundan zərrə qədər kənara çıxmayannəcib insan idi...».* Akademik Ziyab Bünyadov İsmayılın qüdrətini belə şərh edib: *«Şah İsmayıla deyəndə ki, Osmanlı qoşunlarına gecə hücum edək, o, cavabında əsl türk kimi: - Mən karvan basan quldur deyiləm,* - demişdir.

Tarixi həqiqətlər göstərir ki, Şah İsmayıl savadı ilə də həmişə Sultan Səlimi mat qoyub. Yəni, o, Çaldıran döyüşündə Sultan Səlimə məğlub olsa da, məktublarında daima onu dərrakəsi ilə məğlub edib...

Tarixi mənbələrdən bilirik ki, Səfəvi dövlətinin yaranmasında əsas amil dövləti quranların türk olması, həmin dövlətin tarixi Azərbaycan torpaqlarında meydana gəlməsi və buradakı insanların "Qızılbaşlığ"a sadiq olmaları idi. Şah İsmayılın ortaya çıxması və Qızılbaş dövlətini yaratması ilə Anadolu türkmanları öz soylarından, inancından bir öndərə sahib olmuş, onu bir xilaskar hesab edərək sıx bağlanmışlar. Dünya tarixində bir liderə bu dərəcə bağlılıq örnəyi olmamışdır...

Orta əsrlərdə xalqımızın dövlətçilik tarixində Səfəvilər imperiyası Şah İsmayılın rəhbərliyi altında ən yüksək mərhələ kimi diqqət çəkir. Bu imperiya çoxəsrlik Azərbaycan dövlətçiliyinin əsasını formalaşdırmış, Azərbaycanın türk tayfalarını birləşdirmiş, dövlət quruculuğu ənənələrini, idarəçilik vərdişlərini nəsillərə ötürmüşdür.

Səfəvilər dövlətinin banisi Şah ismayıl Xətainin türklər və Azərbaycanla ayrılmaz əlaqəsi tarixdən məlumdur və bu əlaqə vahid Azərbaycan dövlətinin yaradılmasında böyük rol oynamışdır. Burada inandırıcı bir fakta istinad edək: İsmayıl atası Şeyx Heydərin qatili, Şirvanşah Fərrux Yasar üzərində qələbədən sonra öz düşməninin qüvvələrini tamamilə darmadağın etmək üçün onların sığındığı Gülüstan qalasını mühasirəyə almışdı. İsgəndər bəy Münşi yazır ki, İsmayıl Şirvanın ən əlçatmaz istehkamlarından biri olan Gülüstan qalasının mühasirəsi uzandığı üçün böyük əmirləri yanına çağırıb demişdir: *"Sizə Gülüstan qalası lazımdır, yoxsa Azərbaycan taxtı?".* Müqəddəs Səfəvi xanədanının etiqad sahibləri - Azərbaycan taxtı", - cavabını vermişlər. Həmin tarixi məqsədi həyata keçirmək üçün İsmayıl, yuxarıda dediyimiz kimi, 1501-ci ildə Ağqoyunlu Əlvənd üzərində qələbədən sonra Təbrizə daxil olaraq özünü şah elan etmişdir. Belə deyək, atası Şeyx Heydərin çata bilmədiyi məqsədə o nail olmuş, Azərbaycan torpağının böyük bir qismini vahid Qızılbaş dövlətində birləşdirmişdir. Məhz vahid dövlətçilik əzminin nəticəsi idi ki, Şah İsmayıl Çaldıran döyüşünə qədər məğlubiyyətin nə olduğunu bilməmişdir.

Şah İsmayılın alicənablığı alimənsəblərlə deyil, rəiyyətlə rəftarında da özünü aydın ifadə etmişdir.

Bəllidir ki, Şah İsmayılın Azərbaycan dövlətçiliyi qarşısındakı ən böyük xidmətlərindən biri də öz dövrü üçün xarici siyasət mexanizmlərini formalaşdırmasıdır. Qüdrətli imperiya yaradan Şah İsmayıl həm də Qərbi Avropada Papalıq, İspaniya, Portuqaliya, Venesiya, Genuya və s. ilə səmərəli qarşılıqlı münasibətlərin möhkəm bünövrəsini qurmuşdur. Elə bunun nəticəsidir ki, Səfəvilər dövləti yarandığı gündən qısa müddət ərzində bütün Yaxın və Orta Şərqdə qüdrətli hərbi-siyasi amilə çevrilmişdir. Və Şah İsmayılın yaratdığı Azərbaycan dövlətçiliyi Azərbaycan türklərinin dünyagörüşünün təkamülünə kömək etmişdir. Bu mənada, Şah İsmayıl təkcə böyük dövlət xadimi kimi deyil, həm də cəsur, istedadlı sərkərdə, yüksək mənəvi keyfiyyətləri ilə o vaxtlar Azərbaycana gələn Qərb diplomatlarında da heyranlıq doğuran şəxsiyyət olmuşdur.

Artıq bütün dünya ictimaiyyəti bilir ki, xalqımız minilliklər boyu özlərinin tarixi ərazisi olan Azərbaycan ərazisində yaşaymış, dünya sivilizasiyasına böyük dövlətçilik töhfələri vermişdir. Məhz Şah ismayıl irsində ehtiva olunan dövlətçilik və onun tarixi əsasları yeni strategiyanın mövcud reallıqları və qlobal miqyasda diqqət çəkən əsas inkişaf meylləridir. Belə demək mümkünsə, Xətai dövlətçilik işinin təhlilinə söykənən bütün paradiqmal konturları cızıb. Bu da dövlət və xalqın həmrəy düşüncələrinin, yaşayış tərzinin vəhdət təşkil etməsində həlledici rol oynayır.

Xətainin Azərbaycanı vahid dövlət şəklində xarakterizə etməsi əslində, başlıca qayəsini müstəqillik, azərbaycançılıq, dövlətçilik, ədalətlilik, demokratiya, milli tərəqqi, dünyəvilik kimi ümumbəşəri dəyərlər təşkil edən yeni bir ideologiyadır. Xətainin yürütdüyü dövlətçilik siyasəti nəzəriyyəçilik olmayıb, daha çox praktikdir. Bu siyasət inkişafa xidmət edən mütərəqqi fikir və ideyaları hansısa ictimai rəyə tuş etməmiş, reallıqda təsdiqini tapmış müddəalara əsas vermişdir.

Xətai Azərbaycanda dövlət quruculuğu prosesi həyata keçirdiyi zaman onun qarşısında həm də tarixin bərpa olunması kimi məsul bir vəzifə də durmuşdur. Təsadüfi deyil ki, Xətai Azərbaycan dövlətinin tarixi şüurunun artması, dövlətçilik ənənələrinin qədim köklərinin üzə çıxarılması sahəsində də məqsədyönlü iş aparmışdır. Onun tərəfindən tariximizə dəfələrlə nümayiş etdirilmiş xüsusi diqqət və həssas münasibət sadəcə tarixin bir milli-mənəvi sərvət kimi qorunması təşəbbüsü olmamışdır. Bu, daha çox dərəcədə yüz illər sonra üçün milli dövlət quruculuğu işində, vətəndaşlıq duyğusunun, millətə, dövlətə, vətənə sevgi hissinin gücləndirilməsində tarixə söykənmək və gələcəyə gedən yolu daha möhkəm, daha dərin əsaslar üzərində salmaq istəyinin təzahürü olmuşdur.

Dövlət qurmaq, müstəqil yaşamaq bəşər tarixində heç də bütün xalqlara nəsib olmamışdır. Tarixi quruculuğun lideri kimi böyük əzm və etimada layiq olmaq sərkərdədən - dövlət rəhbərindən fədakar əmək, böyük düha tələb edir və hər bir dövlətin uğurları bu konkret amildən çox asılıdır. Etiraf olunası haldır ki, XV-XVI əsrlərdə fenomen tarixi şəxsiyyət Şah İsmayıl Xətainin yaratdığı milli dövlətçilik tarixin xalqımıza bəxş etdiyi milli sərvətdir. Bu mənada, Xətai Azərbaycan tarixində müstəqil və suveren dövlət simvolu, xarizmatik tarixi siyasətçi, cəsur sərkərdə kimi qalmışdır və qalacaq. Dediyimi z kimi, Xətai Azərbaycanın yeni tarixində bütöv bir epoxanı özündə təcəssüm etdirən, dövlətin siyasi, iqtisadi, hüquqi, sosial-mədəni və elmi əsaslarını yaradan, onların ardıcıl inkişafını təmin edən siyasi kursun və milli inkişaf strategiyasının müəllifi olmuşdur.

Tarixi lider olmağın meyarları və izahı müxtəlifdir. Hələ əsrlər əvvəl Aristotel yazırdı ki, *"siyasi liderliyin ilkin şərti dövlətin gələcəyini öncədən görmək və gördüyünü həyata keçirə bilməkdir".*

Dünya tarixinin təcrübəsi göstərir ki, böyük şəxsiyyətlərin ideyaları cəmiyyətdə baş verən hadisələrə çox ciddi təsir göstərir. Bu baxımdan, Xətainin dünyagörüşü, həyat təcrübəsi və tarixi iradəsi dövlət strategiyasının xüsusiyyətlərini şərtləndirir, ən çətin məqamlarda optimal seçimlər etməyə imkan verir.

Dediyimiz kimi, XV-XVI əsrlər Azərbaycan xalqının həyatında taleyüklü bir dövr olmuşdur. Tarixin bu dövründə baş verən hadisələr dahi tarixi şəxsiyyəti - Xətaini səhnəyə gətirmişdir. Dünya siyasi tarixində baş verən hadisələrin mürəkkəbliyi, bir quruluşa malik dövlətlərin məhvi, digərlərinin yaranması baxımından XV əsrin sonları heç bir dövrlə müqayisə edilə bilməz. Xətai o zamanlar çox yaxşı bilirdi ki, Azərbaycan mövcud olduğu coğrafiya, zəngin təbiəti, Şərq və Qərb arasında ortaq-sintez sivilizasiya missiyası ilə diqqət mərkəzindədir və belə bir dövlətin lideri olmaq daha da çətindir. O, nə qədər çətin də olsa, dövlətçilik təcrübəsi ilə Azərbaycanın vahid strateji əsaslarını doğru müstəvidə xarakterizə etmişdir.

Xətainin tarixi xidmətlərini dəyərləndirmək üçün ilk növbədə onun hakimiyyətə gəlişi zamanı mövcud olan dəyişiklik və inqilab dalğasının nə qədər güclü mənbələrdən yönəldildiyini yada salmaq kifayətdir. Həqiqi mənada, Xətai vahid dövlətin yaranmasında və inkişafında, milli birliyin və maraqların təmin edilməsində tarixi rol oynamışdır. Bu məsələlərin həlli onun şəxsi keyfiyyətinə, inamına və təcrübəsinə əsaslanmışdır. Bu, inkaredilməz faktdır.

Milli maraqlar millətin gələcək inkişaf məqsədlərinin təyin edilməsi ilə səciyyələnir. Xətai bu anlamda milli maraqların müəyyənləşməsində əsas rolu öz üzərinə götürmüş, riskləri və mövcud vasitələri dəyərləndirmiş, ölkənin xoşbəxt gələcəyini təmin edəcək yeni perspektivlər haqqında qərarlar vermişdir.

Bəllidir ki, Azərbaycan xalqının dövlətçilik tarixində mürəkkəb mərhələlər çox olmuşdur. Tarix boyu bütün çətinliklərə rəğmən heç bir qüvvə xalqımızın dövlətçilik arzularını, ənənələrini məhv edə bilməmiş, hər dəfə tarixi şəraitə müvafiq olaraq milli, müstəqil dövlət yaratmaq yönündə səylər qarşısıalınmaz sel kimi yenidən baş qaldırmışdır. Məhz Şah İsmayıl Xətainin tarixi xidmətləri sayəsində Azərbaycanda dövlətçiliyin əsasları qoyulmuşdur.

Şah İsmayıl Səfəvi 36 yaşında, həyatının, yaradıcılığının, arzularının ən qaynar çağında dünyadan köçmüş, gördüyü işlər ona ölməzlik qazandırmışdır. Onun yüksək hərbi istedadı haqqında K.Marks yazmışdır: *"Səfəvilər xanədanının banisi Şah İsmayıl fateh idi. O, on dörd illik hakimiyyəti dövründə on dörd əyalət fəth etmişdi".*

Abbasqulu Ağa Bakıxanov "Gülüstani İrəm» əsərində" yazır: *"Hicri 930-cu ilin əvvəllərində (miladi 1524) Şah İsmayıl vəfat etdi. O, mehribanlıqda dünyanı işıqlandıran və qəhrəmanlıqda düşməni yaxan, od məcazlı bir sultan idi. Qurmuş olduğu səltənətin mühüm işlərinə məşğul olmasına baxmayaraq, Şah İsmayıl alimlərlə müsahib olub, şeir söyləməyə də mail idi".*

Şah İsmayıl Xətai şair kimi də məhz dövlətçilik ideyalarına xidmət etmiş, "Xətai" təxəllüsü ilə Azərbaycan türkçəsinə gözəl tarixi əsərlər yaratmışdır.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 7 may 2019-cu il tarixli, 211 nömrəli Qərarı ilə Şah İsmayıl Xətai Azərbaycan Respublikasında əsərləri dövlət varidatı elan edilən müəlliflərin siyahısına daxil edilmişdir.

**Xətai irsi: Dövlətçilik işinin tarixi əsasları**

В статье с научной точки зрения анализируется государственное наследие шаха Исмаила Хатаи, его историческая значимость и ресурсы государственного строительства в целом. Крах процесса, неконтролируемость государства является проявлением сложной ситуации, глубокого кризиса, затрагивающего все сферы общественной жизни. Государственная безопасность - это ключевой вопрос, а внутренние конфликты – это всегда пропасть, чрезвычайная ситуация для государства. Было также подчеркнуто, что политическая мудрость, богатый управленческий опыт, спасательная и творческая миссия великого исторического деятеля шаха Исмаила Хатаи в трудных, экстремальных условиях является решающим шагом к быстрому решению этих роковых задач, реализация его многовекторного плана действий была одной из важных задач.

**Ədəbiyyat**

1. Orta əsrlər tarixi. «Ankara» nəşriyyatı, 2005
2. İskəndər Münşi. Abbasilər sülaləsinin tarixi, 2000
3. Abdi Şirazi. Səfəvilərin dövlətçilik siyasəti. «Tehran» nəşriyyatı, 1968
4. Mirzə Heydər. Səfəvi tarixi (Osman Karatayın çevirməsi), 2006
5. Oqtay Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti. Bakı:«Şərq-Qərb, 2007

**Khatai Heritage: The Historical Foundations of Statehood**

**Summary**

From a scientific point of view, the article analyzes the state heritage of Shah Ismail Khatai, his historical significance, and the resources of state building as a whole. The collapse of the process, the uncontrollability of the state is a manifestation of a difficult situation, a deep crisis affecting all areas of public life. State security is a key issue, and internal conflicts are always an abyss, an emergency for the state. It was also emphasized that political wisdom, rich managerial experience, the saving and creative mission of the great historical figure Shah Ismail Khatai in difficult, extreme conditions were decisive steps towards the quick resolution of those fateful tasks, the implementation of his multi-vector action plan was one of the important tasks.

**Наследие Хатаи: исторические основы государственности**

**Резюме**

В статье с научной точки зрения анализируется государственное наследие шаха Исмаила Хатаи, его историческая значимость и ресурсы государственного строительства в целом. Крах процесса, неконтролируемость государства является проявлением сложной ситуации, глубокого кризиса, затрагивающего все сферы общественной жизни. Государственная безопасность - это ключевой вопрос, а внутренние конфликты – это всегда пропасть, чрезвычайная ситуация для государства. Было также подчеркнуто, что политическая мудрость, богатый управленческий опыт, спасательная и творческая миссия великого исторического деятеля шаха Исмаила Хатаи в трудных, экстремальных условиях является решающим шагом к быстрому решению этих роковых задач, реализация его многовекторного плана действий была одной из важных задач.

Göndərilib: 05.05.2020 Qəbul edilib: 08.05.2020

## FİLOLOGİYA PHILOLOGY ФИЛОЛОГИЯ

DOI: 10.36719/AEM/2007-2020/55/47-49

**Zəminə Xosrov qızı Gülüstani**
Mingəçevir Dövlət Universiteti
gulustani64@mail.ru

# BAYAT VƏ DƏMİRÇİ ETNOTOPONİMLƏRİNİN LİNQVİSTİK TƏHLİLİ

***Açar sözlər:*** *etnotoponim, Güney Azərbayan,Türk mənşəli, toponim, Bayat, Dəmirçi*
***Keywords****: ethnotoponyms, South Azerbaijan, Turkish origin, toponymy, Bayat, Demirchi*
***Ключевые слова****: этнотопоним, Южный Азербайджан, тюркское происхождение, топоним, Баят, Демирчи*

## Giriş

Etnonim və etnotoponimlər hər bir xalqın, o cümlədən də həmin xalqa aid xüsusi ad sisteminin öyrənilməsində müstəsna rol oynayır. E.Murzayev yazır ki, etnoslar və onların əsasında formalaşan toponimlərin həm yaşı qədim olur, həm də onlar assimilyasiyaya məruz qalsalar da, haradasa öz izlərini saxlayırlar. (Э.Мурзаев, 1984: 48-49).

Bu mənada Cənubi Azərbaycanın etnotoponimlərinin sistemli, elmi şəkildə öyrənilməsi həm o zonada türklərin əzəldən yerli etnos-xalq olduğunu və onların tarix səhnəsində oynadıqları rolu əyani şəkildə göstərmək üçün olduqca önəmlidir. Həm də Cənubi Azərbaycan ərazisindəki toponimlərin hansını araşdırırsansa, təxminən etnonim mənşəli olduğunun şahidi olursan. Bunun özü də göstərir ki, oradakı etnotoponimlərin araşdırılması maraqlı elmi nəticələrin əldə edilməsinə gətirib çıxara bilər. Eyni zamanda onun da şahidi oluruq ki, həmin ərazidə qeydə alınan etnotoponimlərin demək olar ki, əksəriyyətinin maraqlı areal xüsusiyyətləri də vardır ki, bu da onların tədqiq olunmasının əhəmiyyətini və vacibliyini bir daha göz önündə canlandırır.

Cənubi Azərbaycan ərazisində saysız-hesabsız türk mənşəli toponimlər vardır ki, etnonim mənşəlidir və onlardan elələri də vardır ki, maraqlı areal xüsusiyyətlərinə malikdirlər. Onlardan biri də Bayat etnotoponimidir. Bayat etnotoponimi digər etnotoponimlərdən birinci növbədə areal kəmiyyəti baxımdan seçilir. (В.И.Савина, 1980: 140-148).

V.İ.Savina Cənubi Azərbaycan ərazisində Bayat etnotoponimi ilə bağlı Zəncan, Leristan, Mərkəzi İran, Azərbaycan bölgələrində Bayar, Bayatlar, Bayatlı, Bayatan, Qızıltəpə Bayat, Bayatansüxtə və s. etnotoponimlərin adını qeyd etməklə onların türk mənşəli olmasını da əsaslandırır.

M.Keyhan V.İ.Savinaya əsaslanaraq məlumat verir ki, Bayatlar Fars əyalətində geniş yayılmış və zaman-zaman məskunlaşmışdır. Şiraz şəhəri və ətraf rayonlarda yerləşmiş Qaşqay tayfasının da iki tirəsindən birinin adı Bayat olmuşdur. O cümlədən 150 ailəlik Bayat məstəli və Bayat şahverdili nəsillərinin də adını göstərmək olur.

İ.Şopen də öz araşdırmasında Şiraz ətrafındakı rayonlarda yaşayan bayatların aparıcı tayfalardan olduğunu vurğulamaqla onların türk mənşəli olduğunu və digər türk olmayan irandilli tayfalara qaynayıb-qarışdıqlarını göstərir, (И.Шорен, 1866: 238).

Bayatlar digər tayfa və etnoslar kimi, xalqımızın etnogenezində mühüm rola malikdir. Bu tayfa da digər etnoslar kimi, orta və yaxın şərq ölkələrinə, xüsusilə də Azərbaycanda şərqdən qərbə, şimaldan cənuba və əksinə köçürülmə siyasətindən və bəzən də köçmə siyasətindən kənarda qalmamış, Suriya, Livan, İrak ərazilərinə və başqa yerlərə getmişlər. Tarixi mənbələrin verdiyi məlumatlara görə, Bayatlar Əmir Teymurun şərqə yürüşü zamanı onların əksəriyyəti yenidən Cənubi Azərbaycan ərazisinə qaytarılmış, bir hissəsi Xorasan, böyük bir hissəsi isə Həmədan və Tehran arasında yerləşdirilmişdir. İndinin özündə də Cənubi Azərbaycan ərazisində Bayatların böyük bir hissəsi məhz Həmədanla Tehran arasında yaşayırlar.

O.Əfəndiyev qeyd edir ki, Bayatların Səfəvilərin hakimiyyətə gəlməsində xüsusi rolu olmuşdur. (Azərbaycan tarixi, 1999: 136; B.Əbdülqazi, 2002: 38; Q.Qeybullayev, 1991: 67; İ.Cəfərsoylu, 2010: 34)

Cənubi Azərbaycan ərazisində Təbriz yaxınlığında, Aşağı Bayat, Yuxarı Bayat, Zəncanda Qızıltəpə Bayat, Urmiyada Bayatlar, Miyanada Bayatlı, Bayatlar, Makuda Ataş Bayat və s., etnotoponimlər bayatların qalıqlarıdır.

Mənbələrdə Dərbənd şəhərinin qapılarından birinin adı da Bayat qapısı olduğu göstərilmişdir. (Q.Məşədiyev,1995: 48; M.Vəlili, 1993: 31)

Məşhur türkmən onomatoloqu S.Ataniyazov bayat tayfasını orta əsrlər oğuz türkmənlərinin ən böyük tayfa birliklərindən biri hesab etməklə bayatın türk dilində “varlı” “əsilzadə” mənasında olduğunu və onların Əfqanıstan, Özbəkistan, Türkmənistan, Tacikistan, Azərbaycan, İran, Türkiyə, İraq və Suriya ərazisində yaşadıqlarını əsaslandırır (M.Vəlili, 1993: 54).

T.Əhmədov, E.Əhmədov, A.Bayramov, T.Şükürova və başqaları da Bayat etnonimi və onun əsasında formalaşan etnotoponimlərindən danışarkən onun türk mənşəli olmasının və əsasən səfəvilər dövründə Şimali Azərbaycan ərazisinə cənubdan köçürüldüklərini qeyd edirlər (T.Əhmədov, 1988: 31,4,48; A.Bayramov, 2008: 131).

H.Mirzəyeva, İ.Bayramova və N.Əsgərov da araşdırmalardan da, o fikri müdafiə edirlər ki, Bayat etnonimi və onun əsasında formalaşmış yer-yurd adları eyni adlı tayfanın, etnosun adını əks etdirir və onlar zaman-zaman digər türk-oğuz və qıpçaq tayfaları ilə qaynayıb-qarışmışlar (İ.Bayramov, 2008: 41,9,61; H.Mirzəyev, 1997: 57).

Q.Qeybullayev və N.Əsgərov tədqiqat nəticəsində müəyyənləşdirmişlər ki, Bayat tayfası Azərbaycan türklərinin etnogenizinə elə daxil olmuşdur ki, onunla bağlı Bayatı-Şiraz, Bayatı-Əcəm, Bayatı-Qaçar, Bayatı-İsfahan, Çoban-Bayatı və s. nümunələr folklorumuzda əbədi olaraq yaşayacaqlar. “Bayatı” janrının da bir folklor janrı kimi, Bayat tayfasının adı ilə bağlı olduğu sübut olunmuşdur. Bayatı çağırmaq, “bayatı demək” ifadələrində də Bayat tayfası ilə bağlı bir çox cəhətlər vardır (Q.Qeybullayev, 1991: 86-87).

İ.Cəfərsoylu türk dillərində teonim və etnonimlərdən danışarkən qeyd edir ki, Bayat etnonimi teonim mənşəlidir. O, Byat etnoniminin teonim mənşəli olduğunu sübut etmək üçün Y.Balasaqunlu, B.Ögəl, F.Sümər, F.Rəşidəddin və digər mənbələrə istinad etməklə hesab edir ki, həmin etnonim qədim türklərin inancları ilə bağlıdır (İ.Cəfərsoylu, 2010: 46-48).

İ.Cəfərsoylunun ümumi qənaəti belədir ki, bir çox etnonim kimi türk mənşəli etnonim hesab olunan Bayat da, ən qədim dövrlərdə teonim olmuş, sonra etnonim, oradan da etnotoponimə keçmişdir. Bu mülahizə bizə elə gəlir ki, daha doğru və ağılabatandır.

Dəmirçi etnotoponimi. Cənubi Azərbaycan ərazisində maraqlı və kifayət qədər geniş areala malik etnotoponimlərdən biri də Dəmirçidir. T.İbrahimov yazır ki, Meşginin köçəri Şahsevənli tayfalarının içərisində ən böyük tayfalardan biri də Dəmirçidir (T.İbrahimov, 1988: 34). Ərdəbil nahiyəsində Dəmirçi , Dəmirçi xarabası, Aşağı və yuxarı Dəmirçi, Dəmirçili kəndləri, Miyandab və Xocadeh vilayətində Dəmirçi oykonimləri qeydə alınmışdır. Şimali Azərbaycan ərazisində də Qarabağ, Gəncəbasar, Qərbi Azərbaycan, Şirvan Mərində də xeyli Dəmirçi etnonimi ilə bağlı toponimlər vardır. Qubadlıda Dəmirçilər, Tərtər rayonunda Dəmirçilər, Bərdə, Qazax, Kəlbəcər rayonlarında Qaradəmirçi, Dəmirçidam, Birinci və İkinci Dəmirçi, Bəydəmirçi və s., xüsusi adları göstərmək olar ki, onların hamısı Dəmirçi etnomin ilə bağlıdır.

A.Axundov yazır: “İstər Dəmirçi,istərsə də Dəmirçilər toponimləri ehtimal ki, türkdilli Dəmirçilər tayfasının adından yaranmışdır. XIII əsr tarixçisi Şahabəddin Nəsri onların Çingiz xanın nəslindən olduğunu göstərmişdir.” XIX əsrdə yaşamış M.M.Xəzaniyə görə, onlar Azərbaycanın Qarabağ xanlığının ilk xanı olan Pənahəli xan Cavanşirin dövründə gəlmişlər (A.Axundov, 1983: 42).

M.Vəliyev, İ.Bayramov, P.Musayev, F.Xalıqov, Q.Məşədiyev, N.Əsgərov və başqaları da Dəmirçi və Dəmirçilər toponiminin etnotoponim olduğunu göstərirlər. Ancaq, S.Mollazadə isə Azərbaycanın Şimal qrupu toponimlərindən söhbət açarkən Qəbələ rayonunda qeydə alınan Dəmirçi oykonimini “dəmirçi olan yer” mənasında izah edir (S.Mollazadə, 1979: 75).

## Nəticə

Sonralar Azərbaycan toponimiyasında və etnonimlərlə bağlı aparılan tədqiqatlar göstərdi ki, demək olar ki, dəmirçi, dəmirli və onlarla bağlı formalaşmış yer-yurd adlarının hamısı etnonim mənşəlidir. Bunu sübut edən faktlardan biri də Dəmirçi xüsusi adının areal xüsusiyyətidir. Belə ki, İran, Suriya, İrak, Əfqanıstan, Özbəkistan, Türkmənistan, Başqırdıstan, Qərbi Azərbaycan, Gürcüstan və Dağıstan ərazisində Dəmirçi, Dəmirçilər, Dəmirçidaş, Temirçi, Baytemir, Şorlu Dəmirçi, Dəmirçili, Temürçə Zilgahı, Temürçü Qurar və s. kəndlərinin digər yaşayış məntəqələrinin də olması və əhalinin türk olması həmin faktı daha da gücləndirir.

Cənubi Azərbaycan ərazisindəki etnotoponimləri nəzərdən keçirərkən şahidi oluruq ki, onların demek olar ki,əksəriyyəti türk mənşəlidir və onların geniş yayılma arealları vardır. Bunun da səbəbi könüllü və məcburi miqrasiyalar, o cümlədən köçürmə və köçürülmə siyasətləri olmuşdur.

## Ədəbiyyat

1. A.Axundov. Torpağın köşkündə tarixin izləri. Bakı, 1983-1363
2. Azərbaycan tarixi. Yeddi cilddə. III cild. Bakı, 1999-4889.
3. Əhmədov T. Azərbaycanın paleotoponimiyası. Bakı, 1988,1319
4. Əhmədov E. Azərbaycan etnonimləri. Bakı, 2007, 1568

5. Bayramov İ. Qərbi Azərbaycanın türk mənşəli toponimləri. Bakı. 2008
6. Bayramov A. "Kitabi-Dədə Qorqud" toponimləri və Qafqaz. Bakı. 2008. 405 s.
7. Cəlilov. F. Qədim türk etnonimləri (Qamət/Kimmer). AOP. Seplusu. Bakı, 1886.
8. Əliyev V. Azərbaycan toponimyası. Bakı 1999.
9. Əsgərov N. Areal türk onomastik vahidlərinin lingvistik xüsusiyyətləri. Bakı, 2005, 485 s.
10. Əbdulqazi B. Şəcereyi-tərqkimə. Bakı. 2002. 194
11. Faruk, Sümər, Oğuzlar, Bakı 1992.
12. Hüseynzadə Ə. Müasir Azərbaycan toponimiyasında tayfa adları. Bakı, 1988
13. Xalıqoo F. Folklor onomastikası. Bakı, 1998, 137
14. Qeybullayev Q. К.Этногенезу Азербайджана, Bakı 1991.
15. Qurbanov A. Azərbaycan dilinin onomologiyası. Bakı, 1988.
16. Qumilyev L. Qədim türklər. Bakı, 1993
17. Мурзаев.Э. Словар народных географгеских тегтигов. Москва.1984
18. Савина В.И.Этнонимы в топонимии Ирана Опотаеттика Востака, Москва. 1980.
19. Əfəndiyev O. Azərbaycan Səfəvilər dövləti. Bakı 1993. 301.
20. Mirzəyev H. Aşıq poeziyasında yaşayan adlarımız və tariximiz. Bakı, 1997.
21. Cəfərsoyluv İ. Türk dillərinin teonim və etnonimləri, Bakı, 2010
22. İbrahimov T. Qaşqaylar. Bakı. 1988
23. Mollazadə S. Топокимия северных рошоков Азербайджана, Bakı 1979
24. Məşədiyev Q. Qafqaz ərazi və tayfalarının təsviri materialları "məcmuə"sində (СМОМПК) qeydə alınmış Azərbaycan (türk) mənşəli toponimlərin tarixi- linqvistik təhlili Bakı. 1995
25. Vəlili M. Azərbaycan (coğrafi-təbii, etnoqrafik və iqtisadi mülahizat) Bakı, 1993
26. Атаниязов С. Словарь туркменских этнонимов. Ашхабад.1988
27. Шорен И. Новыя заметки по древний истории Кавказа и Новия обитателей. 1866. 501 с.

**The linguistic analysis of the ethnotoponyms Bayat and Demirchi**
**Resume**

The territory of South Azerbaijan is one of the areas where different tribes live and become related. Research and descriptions show that most of the tribes and ethnic groups living in the area were of Turkish origin and are still Turks. Their language, anthropological features and traditions also give grounds to say so. The systematic, scientific study of ethnotoponyms of South Azerbaijan is very important to show that the Turks in that area have always been a local ethnos-people and to explain their role on the stage of history. Also, if you study any of the toponyms in the territory of South Azerbaijan, you will witness that they are of approximately ethnonymic origin. This shows that the study of ethnotoponyms there can lead to interesting scientific results. At the same time, we are witnessing that almost all ethnotoponyms registered in the area have interesting habitat features, which once again highlights the importance and significance of their study.

It is interesting that almost all ethnotoponyms registered in the territory of South Azerbaijan have an area. This is due to the migration of the ethnoses that naturally make them up, and from time to time they grow, divide and settle. The linear analysis of the ethnotoponyms Bayat and Demirchi also confirms the above.

**Лингвистический анализ этнотопонимов Баят и Демирчи**
**Резюме**

Территория Южного Азербайджана является одной из областей, где живут и смешиваются разные племена. Исследования и описания показывают, что большинство племен и этнических групп, проживающих в этом районе, были турецкого происхождения. До сих пор на этой территории проживают тюркские народы. Их язык, антропологические особенности и традиции также дают основания говорить об этом.

Интересно, что почти все этнотопонимы, зарегистрированные на территории Южного Азербайджана, имеют свой ареал. Это связано с миграцией этносов, что естественным образом этому процессу. Время от времени они растут, разделяются и оседают. Лингвистический анализ этнотопонимов Баят и Демирчи в Южном Азербайджане также подтверждает вышесказанное.

**Rəyçi: prof.F.Xalıqov**

Göndərilib: 03.07.2020 Qəbul edilib: 05.07.2020

DOI: 10.36719/AEM/2007-2020/55/50-54

**Sevinc Ağadin qızı Bağırova**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)

# ORİYENTAL ROMANTİZMİN XIX ƏSR RUS ƏDƏBİYYATINDA VƏ İCTİMAİ FİKRİNDƏ TƏZAHÜR FORMALARI

***Açar sözlər:*** *oriyentalizm, Şərq, islam, rus ədəbiyyatı, rus romantizmi, ictima fikir*
***Key words****: Orientalism, East, Islam, Russian literature, Russian romanticism, public opinion*
***Ключевые слова:*** *ориентализм, Восток, ислам, русская литература, русский романтизм, общественное мнение*

Rus mədəniyyəti və ədəbiyyatı əsrlər boyu müxtəlif mədəni-dini sistemlərlə, ilk növbədə Şərq-islam dini anlamlarla sıx bağlı olmuşdur. Buna görə də, rus mədəniyyəti və əxlaqında xristian dəyərli həlledici rol oynamasına baxmayaraq milli şüurun formalaşmasında Şərq mədəniyyətinə xas fəlsəfi-estetik və sosial dəyərlər əhəmiyyətli rol oynamışdır. Şərq dünyagörüşü, əxlaq və mədəniyyətinin, o cümlədən klassik ədəbiyyatının mənəvi əsasını islam təşkil etdiyindən, rus ictimai fikri və ədəbiyyatında islama maraq, islam dəyərlərinin mənimsənilməsi təbii proses idi.

Lakin, islam Şərqdə yaranmış və Şərq təfəkkürünə, mənəviyyatına, mədəniyyətinə dərindən sirayət etmiş din idi. Rus mədəniyyəti və ədəbiyyatı, o cümlədən romantik ədəbiyyatı isə xristianlıq zəminində təşəkkül tapmışdı. Rus ədəbiyyatının sonrakı dövrlərində də xristian-pravoslav dəyərləri əsas mənəvi-ideoloji mənbələrdən idi və olmaqda da davam edir. Buna görə də belə fərqli sistemlərin – xristian-pravoslav və islam meyarlarının rus ədəbiyyatında yaxınlaşması, bəzi hallarda qovuşması və aparıcı mövzu və ilham mənbəyinə çevrilməsi olduqca maraqlı faktdır. Lakin, fərqliliklərə baxmayaraq əsaslı məsələlərdə çox zaman yaxınlıq, bəzən isə hətta ortaq olan məqamlar vardır.

Rus mütəfəkkiri P.Y.Çaadayev bu haqda yazırdı: "Monoteist din yaratmış bəzi qədim yəhudi peyğəmbərlərinin adı kimi Məhəmmədin adını haqlı olaraq son məqamında həqiqətin obyektiv dərkinə can atan müdriklərə aid etmək lazımdır. Və gələcəkdə də bəşəriyyət Məhəmmədə insan nəslini xilası məqsədi ali müdrikliyin gerçəkləşməsinə hamıdan çox dəstək olmuş ali müqəddəs varlıq kimi baxacaq" [1, c.396-397]. P.Y.Çaadayevin mülahizələri belə bir həqiqəti – dinlərarası əlaqə və vəhdəti bir daha təsdiqləyir: "İslam – ümumi Qanunun ən gözəl təzahürlərindəndir. Əks düşüncə xristianlığın islama dərk olunmamasını göstərir". Rus filosofu və ədibi düşüncələrini davam etdirərək qeyd edir: "...Quranda demək olar ki, elə bir hissə yoxdur ki, orada İsa Məsihin moizələrindən danışılmasın. Axı bütövlükdə islam – yeni dinin yaranması ilə Şərqdə başlanan dini axtarışların nəticəsi idi. Bu, sanki xristianlıqdan doğmayan o hadisələrdəndir ki, əslində ondan qaynaqlanır" [1, c.429-430]. Təbii ki, sonuncu səmavi din olan islam özündən əvvəlki ilahi kitabları və dəyərləri qəbul edir, ancaq yeni bir inanc kimi ilahi həqiqətə yaxınlığı ilə onlardan həm də fərqlənir. Lakin bütün bunlara baxmayaraq, P.Y.Çaadayev kimi mütəfəkkirlərin Qurani-Kərim, islam, Məhəmməd Peyğəmbər haqqında belə düşüncələri rus ictimai fikrində islam-xristianlıq kolliziyasını aradan qaldırmağa, islama marağın güclənməsinə təkan verirdi.

P.Y.Çaadayevin bu kimi fəlsəfi-ideoloji mülahizələri, dinlərarası bağlılığın qabardılması rus tarixinin faktları, ilk növbədə Rusiyanın Qafqaz, Orta Asiya, Volqaboyu və Sibir tatarları ilə sıx əlaqələri və bu əlaqələrin mədəniyyətdə, dildə, ədəbiyyatda təzahürləri ilə də təsbitlənirdi.

Rus ədiblərinin yaradıcılığında qədim türklərlə, xüsusən tatarlara, azərbaycanlılara və digər müsəlman xalqlarına və onlarla əlaqələrə fərqli münasibət gözə çarpır. Rusların monqol-tatarlarla münasibətləri "İqor alayı haqqında dastan"da mühüm yer tutur. Bu məsələlər rus elmi və ədəbi fikrində də geniş yer tutmuş və araşdırılmışdır. A.N.Kononov, V.N.Tatişev, N.M.Karamzin, S.M.Solovyov, V.O.Klyuçevski, Q.V.Vernadski, N.S.Trubetskoy, P.N.Savitski, N.İ.Kostomarov, L.N.Qumilyov və başqa alimlər Qədim Rusiyanın mədəniyyət və ədəbiyyatında türk elementi haqqında fikir söyləmiş, tədqiqat aparmışlar. Avrasiyaçılıq hərəkatında da bu mövzu əsas mövzulardan olmuşdur. Bu məsələ filoloqları, şair və yazıçıları, eləcə də tarixçiləri, coğrafiyaçıları, ilahiyyatçıları, kulturoloqları cəlb etmişdir.

Şərq və Qərb, islam və xristianlıq arasında müxtəlif səpgili müqayisələr çox erkən dövrlərdən başlasa da, rus filologiyasında XIX əsrin əvvəllərindən xüsusi siqlət və dərinlik qazanmağa başlamışdır. 1821-ci ildə ilahiyyatçı dairələrdə də yaxşı tanınan şərqşünas Mixail Bobrovski Vilen Universitetində elmi müzakirələrdə "Ərəb kitab dilinə və bu xalqın ədəbiyyatına tarixi-ədəbi baxış" adlı məruzə ilə çıxış etmişdir. Dissertasiya işimizdə bu çıxış bizi özlüyündə elmi dəyərinə görə deyil, ərəb ədəbiyyatı əsasında Qurani-Kərim ayələrini və İncilin müqayisəsinə görə cəlb edir. M.Bobrovski tarixi faktlara və müşahidələrinə əsaslanaraq yazır ki,

VIII əsrdən XI əsrə qədər Avropanı "tam cahilliyin "qatı zülməti" bürümüşdü", "ilham pəriləri isə özünə ərəb xalqı arasında sığınacaq tapmışdı". Məhz buna görə də ərəb filosofları "yunanlar və romalılarla şöhrət yarışına girmişdi". Digər tərəfdən, müəllif Orta əsrlər ərəb dilinin öyrənilməsi zərurətini məhz İncil ekzegetikasının mənbəyinin öyrənilməsi baxımından əsaslandırır[1] [2]. M.Bobrovski belə bir qənaətə gəlir ki, Quranı və Şərq poeziyasının polisemiyasını öyrənməklə Şərq mentalitetinin xüsusiyyətlərini anlamaq və İncilə tamamilə başqa bucaqdan baxmaq olar. Mütəxəssislərin dediyi kimi, "belə məqalələrin məzmunu rus oriyental romantik bədii ədəbiyyatında Şərq mövzu və motivlərinin inkişafına, üslubi və sintaktik ifadəsinə nəzərəçarpacaq qədər təsir etdi" [3, c.45].

Həqiqətən də bir çox rus romantik yazıçıları romantizmin ilk mərhələlərindən İncilə müraciət edərək milli və ümumbəşəri dəyərlərin kökünü, həyatın mənasını, ideal haqqında düşüncələrini məhz burada axtarırdılar. Lakin romantizmin bəşəri mahiyyəti, cahanşümul mətləblərə yönəlməsi, adiliklərdən uzaqlaşaraq ülviyyətə can atması nəticəsində onun dini-fəlsəfi dairəsi genişlənirdi. Eyni zamanda rus romantikləri Avropa və o cümlədən Rusiyanın adi, ənənəvi, tanış həyat tərzini qəbul etmir və alternativ kimi Qafqazın, Şərqə xas məchulluq və ekzotikada axtarırdılar. Şərq ruhunun, mentallığının əsası isə islam dini, Qurani-Kərim hikməti idi. Rus romantiklərinin islama marağı həm də bundan qaynaqlanırdı.

Beləliklə, erkən dövrlərdən mövcud olan rus-slavyan əlaqələri rus xalqının mədəniyyətinə ciddi təsir göstərmişdir və "türk xalqlarının və etnoslarının rus superetnosunun formalaşmasında və qədim rus cəmiyyətinin inkişafında türk xalqlarının və etnoslarının xüsusi rolu inkar edilmir" [4, s.17-18]. Lakin qədim və Orta əsrlər dövründə rus ədiblərini Şərqə, müsəlmanlara olan marağı əsasən ekzotik aləmə maraq səviyyəsində idi, bir çox hallarda isə, "bizlər və yadlar" kolliziyası şəklində gerçəkləşirdi.

Təbii ki, XIX yüzilliyə qədər rus ədəbiyyatında ümumilikdə, o cümlədən Şərqə, münasibətdə romantik dünyagörüşü haqqında danışmaq mümkün deyil. Romantizm rus ədəbiyyatında ədəbi məktəb kimi XIX əsrin əvvəllərindən meydana çıxır və məhz bu mərhələdən də Şərq aləminə romantizm dünyagörüşünə uyğun konseptual ədəbi-fəlsəfi münasibət formalaşır. Lakin rus romantik oriyentalizmində ədəbi prosesin əvvəlki dövrlərinə xas oriyental motivlərin rolu da danılmazdır. Hələ XII-XIV əsrlərdə bəzi mətnlərdə qəhrəmanlıq pafosu və Şərq ekzotikasının yaratdığı romantik çalar duyulur. Rusiya tarixən Şərq xalqları, Qafqaz, Krım, Osmanlı imperiyası, İranla təmasda olduğundan bu ərazilərə və xalqlara aid motivlər, o cümlədən, ən qədim vaxtlardan Şirvan, Şamaxı, Dərbənd folklorda, yazılı salnamələrdə xatırlanırdı. XV əsrdən başlayaraq isə Afanasi Nikitinin "Üç dəniz arxasına səyahət", İvan Peresvetovun "Sultan Məhəmməd haqqında hekayət", N.M.Karamzinin "Rus dövləti tarixi" kimi əsərləri, "Qazanın tarixi", "Türklərin Çarqradı tutması haqqında povest", "İvan Novosilsevin Türkiyəyə səfarəti", Fedot Kotovun, Vasili Monaxın səyahətnamələri, Şərq ədəbiyyatından tərcümələr də XIX əsr rus romantik və realist ədəbiyyatında Şərq mövzusunun və müsəlman mətninin formalaşmasında müəyyən rol oynayıb. Qeyd edək ki, bu proses bir qədər başqa çalarda XVI əsrin sonu-XVII əsrin əvvəllərindən Avropa ictimai fikri və ədəbiyyatında da izlənmişdir. Qərb maarifçiliyi və romantizmində yayılmış filoriyentallıq hərəkatı da rus romantik oriyentalizminə ciddi təsir etmişdir.

Rus ədəbiyyatı özü də estetik və ideoloji cəhətdən fərqli cərəyanlara, qərbçi, slavyanofil, asiyaçı, bir qədər sonra avrasiyaçı meyllərə ayrıldığından Şərqə münasibət də birmənalı deyildi. Cox vaxt müəllif mövqeyi, ədəbi cərəyan, hətta dövrün dəbi də bu münasibətə təsir edirdi. Orta əsrlər rus ədəbiyyatı ilk növbədə xristian-pravoslav ideologiyasına əsaslanırdı. Orta əsrlər ədəbi mətnləri ilahi mənaları ifadə edir, sakral (dini-kilsə) və ictimai-ədəbi sferaları birləşdirirdi. Ədəbiyyat daha çox dini mətləbləri ifadə edir, həyatda və yaradıcılıqda iman, saflıq kimi anlayışlar təbliğ olunurdu. Ədəbi mətnlərdə mücərrəd fəlsəfilik və müəyyən romantik pafos izlənilirdi. Pyotraqədərki sekulyar ədəbiyyatda hələ idrak, maarif, təbiət və insanın vəhdəti, təbii insan idealı kimi anlayışlar yox idi. Bütün bunlar rus maarifçi və romantik, müəyyən qədər realist ədəbiyyatında Avropa maarifçiliyinin, Russonun "təbii insan" ideyasının təsiri ilə meydana çıxdı. Erkən Orta əsrlərdə rəsmi-kilsə məfkurəsi rus ictimai şüurunda pravoslavlıqdan kənar ideyaların yayılmasına meylli deyildi.

XVII-XVIII əsrlərdən başlayaraq maarifçi humanizm və bir qədər sonra romantizmin inkişafı nəticəsində digər mədəniyyətlərə xas motiv və simvolları özündə əks etdirən nümunələr rus ədəbiyyatına, mədəniyyət və incəsənətinə daxil oldu. Bu nümunələr alternativ sosial modellər və estetik idealları özündə təcəssüm edirdi. Romantizm geniş və çoxqatlı anlayış idi və maarifçiliklə bağlı olsa da, bir çox cəhətdən onun alternativi və inkarı kimi meydana çıxmışdı. Ədəbi cərəyan və yaradıcılıq metodu kimi gerçəklikdən uzaq ülvi ideala yönələn romantizm maarifçi idraka əsaslanan sivilizasiyanı, şəxsiyyəti əzən ictimai buxovları inkar edir, idealı irrasional və ekzotik aləmlərdə axtarırdı: "Romantizm bütün Avropa ölkələrinə yayılmış anti maarifçi hərəkatın zirvəsi kimi aşkarlandı... Tarixin reallığı idrak üçün əlçatmaz, irrasional və sirlərlə,

---

[1]Ekzegetika – ilahiyyatın İncil mətnlərinin təfsiri ilə məşğul olan sahəsi

gözlənilməzliklərlə dolu, müasirlik isə - ilk növbədə insan təbiətinə və onun azadlığına düşmən oldu" [5, s.334]. Romantizm müasir sivilizasiyanın alternativini müxtəlif rəmzlərdə - ibtidai keçmişdə, ideal gələcəkdə, təbiətdə, ekzotik aləmlərdə, o cümlədən Şərqdə, rus romantik ədəbiyyatında isə ilk növbədə Qafqazda tapırdı. Romantizmə xas olan oriyentalizm ümumavropa filoriyentalizminin tərkib hissəsi olsa da, XVII-XVIII əsrlərdəki, eləcə də maarifçilikdəki oriyentalizmdən fərqlənirdi. Terminoloji mənada oriyentallıq dedikdə dünya mədəniyyətində Şərqə olan filoloji və bədii-estetik, kulturoloji marağı nəzərdə tutan İ.S.Braginski, F.Z.Kanunov, N.İ.Konrad, V.M.Jirmunski, A.S.Yanuşkeviç, N.B.Remorov, N.Y.Berkovski və başqaları filoriyentalizmin romantizmlə olan bağlılığından yazırdılar. Romantik ruhlu əsərlərdə hələ Orta əsrlərdən izlənən Şərq mövzusu XIX əsrin ilk onilliklərində rus ədəbiyyatında aparıcı mövzulardan birinə çevrilir. Rus ədiblərinin Qafqazla tanışlığı Şərq və islam mövzusunu xüsusilə aktuallaşdırır. Beləliklə, rus ədəbiyyatında böyük təkamül yolu keçmiş Şərq və islam mövzusu romantizmdə konseptual səciyyə qazanır. Tədqiqatçı Q.Danilçenko qeyd edir ki, "Filoriyentalizm həm də rus maarifçiliyinin tərkib hissəsi idi. Rusiyanın Şərqlə əlaqələri Qərbi Avropanın Asiya ilə əlaqələrinə nisbətən daha müstəqim və üzvi idi. Bu, hələ Şərq mövzusunda yazılan ilk rus əsərlərində (məsələn Daniil Zatoçkin, Stefan Novqorods) duyulurdu. Bu əsərlərdə Şərq xalqlarına qarşı aqressiv və etinasız münasibət yox idi. XV əsrdə, Afanasi Nikitinin "Üç dəniz arxasına səyahət" əsərindən sonra, Rusiyada, xüsusən XV-XVII əsrlərdə Şərq ölkələri və xalqları haqqında məlumatın həcmi güclü şəkildə artdı" [6, c.17].

Filoriyentalizmin bir sıra təməl anlayışları var idi. Bunlardan əsaslarını qeyd edək. Filoriyentalzm ilk növbədə "məsum sadə (ibtidai, "vəhşi") insan" ideyasını təsdiqləyir, avropalıların "məkr və zülmünə" qarşı ideallaşdırılmış və romantikləşdirilmiş "alicənab hindliləri", "müdrik türkləri", sakit və taraz ərəbləri, döyüşkən və şücaətli hinduları qoyurdu. Rus romantik ədəbiyyatında müasir sivilizasiyanın naqisliyinə qarşı qoyulan bu obrazların başlıcası Qafqaz xalqlarının nümayəndələri idi. Qeyd edək ki, təmiz, saf, ilkin dəyərlərlə yaşayan sadə insanlarla burjua əxlaqının daşıyıcıları arasında bu təzad maarifçilikdə də mühüm yer tutub. Bu məsələdə varislik hiss olunurdu. Bu baxımdan Volterin yaradıcılığında romantik çalarlı oriyental motivləri ("Kandid", "Sadəlövh", "Zadiq" kimi realist səpgili fəlsəfi povestlərin özünəməxsusluğu nəzərə alınmaqla), Moteskyönün "Fars məktubları"nı, eləcə də Puşkin, Lermontov, Bestujev-Marlinski yaradıcılığında romantizm və realizmin qovuşmasını qeyd etmək olar.

Digər tərəfdən, bu yazıçılar romantik ruhlu əsərlərində başqa ölkələrin realist təsvirini (deyək ki, Puşkinin "Ərzuruma səyahət"ində olduğu kimi) deyil, öz estetik-fəlsəfi ideallarını ifadə edirdilər və digər xalqların nümayəndələrinin, o cümlədən müsəlmanların obrazları məhz bu ideyaları bədii inikasına xidmət edirdi. Bu kimi fərqli obrazlar vasitəsilə bəzən cəmiyyətin naqislikləri aşkarlansa da, onlar mahiyyət etibarilə maarifçi və ya romantik idealları – bilik, idrak, savad, bərabərlik, azadlıq, təbiilik və s. kimi ideyaların təbliğinə imkan verirdilər.

Qədim dövrdən başlayaraq XVII-XVIII əsrlərə qədər rus mədəniyyətində oriyentalizmin, o cümlədən islam aləmi ilə çoxşaxəli əlaqələrin Qərbdən fərqli mühüm xüsusiyyətini bir daha qeyd etmək istərdik: Rusiyanın qədim dövrlərdən Volqaboyu tatar dövlətləri – Qızıl Orda, Həştərxan, Qazan xanlıqları, Noqay Ordası, eləcə də Osmanlı, Krım, Qafqaz, İranla siyasi, ticari, iqtisadi əlaqələri mövcud olmuşdur. Buna görə də Şərq motivləri yalnız folklorda deyil, sənədli-publisistik, agioqrafik və bədii ədəbiyyatda da rast gəlinir. Şərq ölkələri ilə intensiv münasibətlərin təsviri bir çox ədəbi-publisistik janrlarda ifadə olunmuşdur: "Bu dövlətlərin tarixi kontaktları, hərbi-siyasi və ticarət münasibətləri hərbi və tarixi hekayətlərdə, səyahətnamələrdə, səfarət povestlərində, rəsmi məlumat və məktublarda tam əksini tapmışdır. Səyahətnamə, səfər oçerkləri və safarət povestləri kimi əsərlər xüsusi əhəmiyyət qazanmışdır. Bu əsərlərdə Moskva Rusiyasının Şərq ölkələri ilə ticari-iqtisadi və diplomatik əlaqələri ətraflı işıqlandırılırdı" [7, c.3].

Lakin bu mərhələyə aid əsərlərin böyük əksəriyyəti təsviri, müəyyən hallarda məlumat səciyyəli idi. Bir qədər sonra göstərəcəymiz kimi, Qədim dövrdən XVIII əsrə qədər Şərqə, xüsusən, müsəlman ölkələrinə münasibətdə siyasi, ideoloji, dini motivlər və çalarlar Afanasi Niktinin, Peresvetov və başqalarının əsərlərində izlənsə də, bütövlükdə oriyentalizm konseptual ədəbi-estetik səviyyəyə yüksəlməmişdi. Bu proses rus ədəbiyyatında ilk dəfə məhz romantizmdə baş verir. XIX əsrin əvvəllərində bütövlükdə rus ictimai şüurunda və ədəbiyyatında, o cümlədən Şərq aləminə olan münasibətdə köklü dəyişikliklər başlayır. Yeni meyillər ədəbiyyatda da özünü biruzə verirdi.

Romantizmdə xüsusilə füsət alan yeni yanaşmaların bir sıra səbəbləri vardır. Əvvəla, rus ədəbiyyatında romantik oriyentalizmin prinsipial yaradıcılıq amili və aparıcı mövzulardan birinə çevrilməsi yalnız siyasi-dövlətçilik maraqları, Rusiyanın xeyli hissəsinin ərazicə müsəlman ölkələri ilə əhatə olunması və tarixi təmasların dərinliyi ilə bağlı deyildi. Coğrafi yaxınlıq və dövlət maraqları Rusiya imperiyasının Şərqə doğru irəliləməsində güclü amil idi. Beynəlxalq Şərq məsələsinin aktuallaşması, Rusiyanın dövlət maraqlarının Şərqə doğru yönəlməsi və digər amillər bədii ədəbiyyata dərin təsir göstərirdi. Xüsusən, millətçi, slavyanofil,

klassisist yönümlü ədiblər imperiya maraqlarını vəsf edir, İstanbulun tutulması, imperiyanın yeni paytaxtına - Çarqrada çevrilməsi Balkanlardan Hindistana qədər pravoslav imperiyanın yaranması barədə əsərlər yazırdılar. Lakin rus romantizmində oriyentalizmin vüsətlənməsi və konseptual anlayışa çevrilməsi bu mövqedən yox, yeni ideal axtarışında olan bu ədəbi cərəyanın mahiyyətindən qaynaqlanırdı. Rus romantiklərinin Şərq mədəniyyətinə və xüsusən islam dininə müraciəti sivilizasiyalararası dialoqun və ədəbi əlaqələrin mühüm hadisələrindən və aktual elmi mövzulardan biri kimi dəyərləndirilməlidir.

XIX əsrin əvvəllərində rus romantizmində oriyentalizm kulturoloji ideyaya, nəzəri anlayışa və bədii rəmzə, sivilizasiyalararası məsələyə çevrilir. Təbii ki, bu fəlsəfi-estetik qavrayış mənşəcə maarifçilikdəki bəşəri sivilizasiya anlayışı ilə bağlı idi. Lakin, maarifçilər sivilizasiyanın gələcəyini qərbyönümlü maarif, idrak, bilikdə görürdülərsə, romantizm təxəyyüldə yaradılmış sosial, mənəvi ideala can atır və bunun təzahürünü qərbyönlü cəmiyyətdə deyil, ekzotik-təbii ölkələrdə, eləcə də islam aləmində, islam dəyərlərində görürdü. Qeyd edək ki, rus oriyental romantizmində sivilizasiya probleminin aktuallığını və səciyyəviliyini görkəmli alim N.İ.Konrad hələ 1960-cı illərdə "Şərq və Qərb" kitabında qeyd etmişdir [8].

İkincisi, Rusiyada Vətən müharibəsinin təsiri ilə Avropa dəyərlərinin daha dərindən mənimsənilməsi və milli oyanışın güclənməsi, eyni zamanda ölkədə baş verən ictimai-siyasi proseslərdən doğan məyusluq romantik ideal axtarışlarına, o cümlədən romantiklərin bu idealın, təbii azadlığın məkanı kimi gördükləri Şərqə, xüsusən Qafqaza, yerli xalqların ilkin təbii dəyərlər üzərində qurulmuş, burjua çirkabına bulaşmamış saf həyat tərzinə, məişətinə, xarakterinə, dini inancına olan marağına güclü təkan verirdi. Bu dövrdə bir çox rus şair və yazıçıları (A.S.Puşkin, A.A.Bestujev-Marlinski, M.Y.Lermontov) Qafqaza şəxsi azadlıqlarını, yaradıcılıq potensialını təmin edən, imperiyanın rəsmi məfkurəsindən və senzuradan xilas edən məkan kimi də bağlanırdılar. Və beləliklə, romantiklər öz yaradıcılığında azadlıq ideallarını sətiraltı, rəmzi vasitələrlə ifadə edirdi.

Rus romantizmi geniş və rəngarəng cərəyan olub. Rus romantiklərinin bir çoxu inqilabi mövqedən çıxış edir və dekabrist hərəkatına qoşulurdu. Digərləri isə təbii həyat konsepsiyasından çıxış edərək qurtuluşu patriarxal həyat tərzində görür və dini mistisizmə qapılırdılar. Məhz bu cür fikir və dünyagörüşü fərqliliyi romantizmin rəngarəngliyini təmin edirdi. Bu isə romantiklərin müraciət etdikləri təsviri vasitələrində fərqliliyinə gətirib çıxarırdı.

Üçüncüsü, XIX əsr rus romantizmi (o cümlədən romantik oriyentalizm) ədəbiyyatda psixologizmi gücləndirdi, Şərq xalqlarının nümayəndələrinin daxili aləminə, xarakterinə sirayət dərinləşdi. Bu dövrə qədər Şərq xalqlarının nümayəndələri müəyyən koloritə məxsus, lakin mücərrəd və ümumiləşmiş personajlar kimi təqdim edilir, fərd olaraq onların daxili aləmi təsvir olunmurdu. Buna görə də belə personajlar ictimai əlaqələrindən, tarixilikdən də məhrum olurdular. Məsələn, Q.R.Derjavinin, K.Batyuşkovun əsərləri əsasən ümumiləşmiş didaktik-tərbiyəvi mahiyyət daşıyır, Şərqin gerçək həyatı, fərdi və fərqli insan xarakterləri deyil, ümumiləşmiş şərqli obrazı təcəssüm olunurdu.

Şərqə fərqli, psixoloji, analitik və məhz Rusiya ictimaiyyətini narahat edən problemlər baxımından münasibət XIX əsrin əvvəllərində A.S.Puşkin, A.ABestujev-Marlinski və M.Y.Lermontov yaradıcılığında meydana çıxdı. Bu dövrdə rus romantikləri əsərlərində Şərq xalqlarının nümayəndələrinin fərdi psixologiyasına, mənəviyyatına, dini inancına dərindən dalmaq, həyat tərzini anlamaq, Rusiyanın sosial mühiti ilə müqayisə etmək və təbii ki, romantizm idealları prizmasından tərənnüm etmək əsas məsələyə çevrilir.

Beləliklə də rus ədəbiyyatında zəngin ənənələri olan islam və müsəlmanlar mövzusu, rus ədəbiyyatının tarixi "müsəlman mətni" özü də yeni mahiyyət qazanır, rus məfkurəsinin, ədəbi fikrinin üzvi tərkib hissəsinə çevrilir, özü ilə yeni motivlər və ideyalar, janr və üslub formaları gətirir.

## Ədəbiyyat

1. Чаадаев П.Я. Полн. собр. соч. и избранные письма в двух томах. М.: Художественная литература, 1991, Т.1, 461 с.
2. Vicipedia.Ru
3. Зубко А. Архиерей Михаил Бобровский. О греко-унитской церкви в западном крае России. СПб, 1889, 153 с.
4. Джафаров Т.Г. Славяно-тюркские связи в литературе Древней Руси. Баку, БСУ, 2003, 285 с.
5. Литературный энциклопедический словарь. М., Советская энциклопедия, 1982, 533 с.
6. Данильченко Г.Д. Романтический ориентализм в русской литературе первой половины XIX века. Дисс. … канд. филол. наук. Бишкек, 1999, 135 с.
7. Джафаров Т.Г. Тюркские элементы в русской литературе XV-XVII веков. Баку: Мутарджим, 2002, 135 с.

8. Тартаковский П.И. Русская поэзия 20-30-х годов и художественное наследие народов Востока. Ташкент: ФАН, 1977, 231 с.

**Forms of realization of Oriental Romanticism in Russian Literature and Public Awareness**
**Summary**

Despite the pivotal role of Christianity in Russian culture and morality, the philosophical-esthetic and social values inherent in eastern culture played an important role in the formation of Russian national identity.

Whereas Islam formed the spiritual basis of the Eastern worldview, morality and culture, as well as classical literature, interest in Islam in Russian public thought and literature, assimilation of Islamic values are considered as a natural process.

Attitude to the East from the point of view of various psychological, analytical and problems that concern the Russian public appeared at the beginning of the 19th century in the works of A.S. Pushkin, A.A. Bestuzhev-Marlinsky and M.Y. Lermontov.

During this period, the main idea in the works of Russian romantics was to plunge into individual psychology, morality, religious beliefs of the peoples of the East, understand their lifestyle, compare with the Russian social environment and, of course, look through the prism of romantic ideals.

**Формы проявления ориентального романтизма**
**в русской литературе XIX века и общественном сознании**
**Резюме**

Несмотря на решающую роль христианства в русской культуре и нравственности, философско-эстетические и социальные ценности, присущие восточной культуре, сыграли важную роль в формировании русского национального самосознания. Поскольку ислам сформировал духовную основу восточного мировоззрения, нравственности и культуры, а также классической литературы, интерес к исламу в русском общественной мысли и литературе, ассимиляция исламских ценностей был естественным процессом.

Отношение к Востоку с точки зрения различных, психологических, аналитических и проблем, волнующих российскую публику, появилось в начале XIX века в работах А.С.Пушкина, А.А.Бестужева-Марлинского и М.Ю.Лермонтова. В этот период главной задачей в произведениях русских романтиков было погрузиться в индивидуальную психологию, нравственность, религиозные верования народов Востока, понять их образ жизни, сравнить с русской социальной средой и, конечно же, спеть сквозь призму романтических идеалов.

**Rəyçi: dos. D.Hümbətova**

Göndərilib: 20.06.2020 Qəbul edilib: 23.06.2020

DOI: 10.36719/AEM/2007-2020/55/55-58

**Bəhram Əndəlib oğlu Quluzadə**
Şamaxı Astrofizika Rəsədxanası
**Gülgəz Sabir qızı Salmanova**
Bakı Slavyan Universiteti

# AZƏRBAYCAN ƏDƏBİYYATI HALLEY KOMETİ HAQQINDA

***Açar sözlər:*** *kometlər, "Molla Nəsrəddin" jurnalı, Hüseyn Cavid*
***Key words****: comets, "Molla Nasruddin" magazine, Huseyn Javid*
***Ключевые слова****: коменть, журнал «Молла Насреддин, Гусейн Джавид*

## Giriş

Hər 75-79 ildən bir uzaq səmanın ənginliklərindən Günəş və Yer ətrafına qayıdan Halley kometinin 1910-cu ildəki gəlişi zamanı onun Yer kürəsi ilə toqquşa bilmək ehtimalı ilə əlaqədar bütün dünya təşvişə düşmüşdü. Həmin dövrlərin şahidi Səid Nursinin "Sözlər"kitabının "Üçüncü söz"ündə [1] oxuyuruq: "...məşhur bir işıqlı ağıl sahibi deyilən qəlbsiz bir fasiq filosof isə göydə bir quyruqlu yıldız görsə, yerdə titrər. – Əcəba, bu sərsəri yıldız ərzimizə çarpmasınmı? – deyər, vəlvələyə düşər. Bir vaxt belə ulduzdan qoca Amerika titrədi. Çoxları gecə vaxtı evlərini tərk etdilər." Qeyd etmək yerinə düşər ki, söz, sənət adamları da kometi vəsf etməkdə idi.

Bütün dünyanı sarsıdan bu ümumbəşəri təşvişə o dövrün bütün Azərbaycan mətbuatı da müxtəlif baxış bucağından münasibət bildirmişlər. "Molla Nəsrəddin" jurnalının materiallarına təzədən baxanda, görürük ki, bu mövzuda iki karikatura, kiçik felyetonlar verilib. Materiallar içində "Quyruqlu Yulduzdan məktub" adlı felyeton mövzuya jurnalist yanaşmasına görə, daha möhtəşəmdi.

Satira dərgisinin reaksiyası öz nikbinliyilə o dövrdə çıxan materiallarla müqayisədə fərqlidir. Məsələn, "**Teleqraf xəbərləri**" adlı kiçik felyetonda oxuyuruq [2]:

**Şamaxı –** Hacı Əbdürrəhim əfəndi öz evindəki yüksək rəsədxanadan böyük aftaba durbini ilə Quyruqlu Yulduzun hərəkətini təftiş edir.

Bu barədə yazacağı məqaləsini köhnədən yazıb Peterburqa göndərdiyi "Heyət" (Astronomiya) kitabına əlavə edəcək.

**Gəncə -** Məhərrəm münasibəti ilə göydə dəhşətli bir Quyruqlu Yulduz görünməyə başladı.

Molla Məşum kəşf edib ki, bu Quyruqlu Yulduz məhərrəmdə baş yaranların başına düşəcək.

Bu kiçik qeydlərində Cəlil Məhəmmədquluzadə böyük uzaqgörənliyilə Şamaxıda rəsədxanın olacağı barədə rişxəndlə olsa belə, öncəgörüm söyləyib.

**№6, 1910, 7 fevral** sayının üzqabığı karikaturasında Yer kürəsinə sürətlə yaxınlaşan kometin içində aşağı səviyyəli kütlənin tipajlarını rəsm edir. Müəllif göstərilməsə də, litoqrafiya (daşbasma) çapının rəssamı "Litoq. S.Bıxova" kimi göstərilir. Üslubundan bilinir ki, bu Oskar Şmerlinqin cizgisidir. Karikaturanın alt yazısında azərbaycanca "Məşhur heyətşünas Səəd üd-Dövlənin rəyinə görə qorxuludur ki, Quyruqlu Yulduz yerlə toqquşa." rusca isə bir qədər başqa cür "Астрономия допускает, что комета можеть столкнуться съ землей" kimi qeydlər var.




Şəkil 1. “Molla Nəsrəddin” jurnalının 1910-cu il 6-cı nömrəsinin üz qabığı.

“**Bu həftə”** adlı yazıda [3] oxuyuruq: “– Bu həftə dəxi nə olub? – Bu həftə Nuxada köhnəpərəstlər “Vətən”məktəbini dağıtmaq istəyiblər. Amma belə məsləhət biliblər ki, nahaq zəhmət çəkməsinlər, çünki mayın altısında Quyruqlu Yulduz onsuz da Yeri dağıdacaq.”

**“Orenburqdan”** adlı felyetonda [4] xüsusi olaraq qeyd edilir: “Cəliliyyə” yulduzunun həlakətindən xilas olmuş Yerli islamlar şadlıqlarından “Din və məişət”jurnalını oxuyurlar.”

Halley kometini o vaxt “Cəliliyyə” kimi tanıyırdılar.

**“Quyruqlu Yulduzun məktubu”** [5] felyetonunda oxuyuruq:

Cənab Molla əmidən xahiş edirəm ki, mənim bu məktubum məcmuənin səhifələrinin birində çap olunsun. Bir neçə vaxt bundan qabaq Yerdə yaşayan insanların arasına bir belə söz düşmüşdü ki, guya mən, yəni Quyruqlu Yulduz may ayının 6-da quyruğum ilə Yeri vurub dağıdacağam. Amma indi insanlar görürlər ki, bu söhbətlərin hamısı yalan çıxıb.

Mən bu xüsusda istəyirəm bir neçə söz danışam.

***

Doğrudur, mənim fikrimdə idi ki, dünyanı bərbad edəm, çünki insanların günahı o dərəcədədir ki, Xudavəndi-Aləm mənə bir neçə dəfə tapşırmışdı ki, bir gün fürsət tapım və quyruğumun ucu ilə Yeri altı üstünə çöndərim. Bir neçə dəfə bu fikrə düşmüşəm, amma mömin şəxslərin duası və istiğa səsi məni bu işdən geri qaytarıb.

Bu keçən may ayının 6-da vaqeən elə az qalmışdım Yerə toxunam, amma Bariu Pərvərdigar mane oldu və qoymadı. Mən dəxi bu dəfə səbr eləmək istəmirdim və hətta Allahın dərgahına üz tutub bir dedim: “Xudaya, bir de görüm məni ələ salmamısan ki?” Bir qədər keçməmişdi ki, təzəkəndli mərhum Hacı Xudaverdiyə təyin olunan məlaikə səmadan bu məzmunda bir namə gətirdi: “Ay Quyruqli Yulduz, səbr elə, günahkarların günahından keç, bu dəfə də onları bağışla həştərxanlı Molla Səttəra.”

Kağızı oxuyub üzümü çöndərdim Həştərxan vilayətinə və gördüm ki, doğurdan da üzündən müsəlmanlıq nuru yağan və gözündən kəsalət şirəsi tökülən bir məlaikəsifət molla minbər üstündə qəzetlərə lənət oxuyur.

Bu imiş Molla Səttar.

Dəxi bu dəfə də bunun xatirəsi üçün Yeri dağıtmadım.

***Müxlisiniz: Quyruqlu Yulduz***”

**№25, 27 iyun 1910** – ci il sayının orta səhifəsindəki karikaturalardan biri Halley kometini mövzusundadır. Müəllif göstərilməsə də, Oskar Şmerlinqin dəsti – xətti o dəqiqə görünür. Karikaturadan

yuxarı və aşağı hissələrdə azərbaycanca və rusca yazılar var. Azərbaycanca yazı: “Tiflisdə “İttifaq” məktəbinin əzl olunmuş müəllimləri. Bu bədbəxtliklərin hamısı Quyruqlu Yulduzun təsiridir.” Rusca yazı: “Увеленные учительля училиша «Иттифагъ» (в Тифлисе). Все эти бедствия оть лщьеты Галилея”

Dilimizdəki yazılarda Halley kometinə, sadəcə “Quyruqlu Yulduz” deyilib.




Şəkil 2. “Molla Nəsrəddin” jurnalının 1910-cu il 25-ci nömrəsinin orta səhifəsindəki karikatura.

Göründüyü kimi, “Molla Nəsrəddin” jurnalının müəllifləri baş verən hər bir məqamdan qarşısına qoyduğu məqsəd və mərama görə istifadə edə bilirdi.

Azərbaycanın əbədiyaşar romantik söz ustası Hüseyn Cavid əfəndinin Halley kometinə həsr etdiyi “Nəcmi-Geysudar” (Saçlı ulduz) əsəri böyük maraq doğurur.

Sən ey yüksək fəzalarda aşan səyyahi-zərrinpər!
Uzaq ey nəcmi-geysüdar! Uzaq gəz, ərşə yaxlaşma!
Uzaqdan pək gözəlsin, mənzərən pək tatlı, pək dilbər.
Məhəbbət yox təqərrübdə, şu məhrəkdən saqın, şaşma. [6.

Şair kometin Yerə yaxınlaşmasından yaxşı heç nə gözlənilmədiyini poetik şəkildə bildirir. Kometi soyuq, biganə bir varlıq kimi qələmə alır. Bəzi fərziyyələrə görə Yerdəki bir çox epidemiyaların səbəbkarı kometlərdir.

Bizim torpaqda naməqbul olur biganələr daim,
Onunçün sevməz insanlar səni, hər kəsdə nifrət var.

Cavid kainatla canlı aləmi paralel şəkildə qarşılaşdırır.
Məramın qəhr isə, get! Onları təsmim edər daim,
Şu ərz üstündə minlərcə geysüdar yıldızlar.

**Ədəbiyyat**

1. Səid Nursi. Sözlər. Bakı, 1910. s.19.
2. “Molla Nəsrəddin” j. 1910, №3, s.7.
3. “Molla Nəsrəddin” j. 1910, №18, s.3.
4. “Molla Nəsrəddin” j. 1910, №21, s.3.
5. “Molla Nəsrəddin” j. 1910, №22, s.7.
6. Hüseyn Cavid. Əsərləri. Bakı: “Lider” nəşriyyatı, 2005.

**Azerbaijan literature about Halley's Comet**
**Summary**

Halley's Comet approaches the Sun and the Earth every 75-79 years. The approaches of comet in 1910 was special. The masters of word devoted many works to this approximation. In the magazine "Molla Nasruddin" the some was published many feuilleton and caricatures about this. In them, the author was scourged by ignorance, rudeness, stupidity. The classical Azerbaijani poet Huseyn Javid dedicated the poem about the approaches of comet.

**Азербайджанская литература о комете Галлея**
**Резюме**

Комета Галлея приближается к Солнцу и к Земле каждые 75-79 лет. Приход кометы в 1910 году был особенным. Мастера слова посвятили этому приближению много произведений. В журнале «Молла Насреддин» то же были напечатаны многие фельетоны и карикатуры по этому поводу. В них автора бичевали невежество, хамство, тупость. Классик азербайджанской поэзии Гусейн Джавид посвятил приходу кометы стихотворение.

**Rəyçi: f.f.d. Ə.Ətayi**

Göndərilib: 05.06.2020 Qəbul edilib: 07.06.2020

DOI: 10.36719/AEM/2007-2020/55/59-62

**Ирада Исмаил гызы Дадашова**
Бакинский славянский университет
ira-xanim12@mail.ru

# СТАНОВЛЕНИЕ КАРЬЕРЫ ЖОРЖА ДЮРУА
## (по роману Ги де Мопассана «Милый друг»)

***Ключевые слова****: карьера, натурализм, эпоха, репортер, честолюбие*
***Açar sözlər****: karyera, naturalizm, dövr, reportyor, ambisiya*
***Key words****: career, naturalism, era, reporter, ambition*

Флобер говорит о Мопассане: он мой ученик, и я люблю его, как своего сына. Он следит за его начинаниями, обязывает не спешить с успехом. По его совету Мопассан долгие годы ничего не будет публиковать. Флобер, опять же, представил его Эмилю Золя, где он стал одним из постоянно присутствующих на его собраниях, там где натурализм выковывался сначала в Париже, а затем в Медане. Буль-де-Сюиф был самым заметным из новых сочинений на Суаре де Медан. Все человечество уже присутствует в этом жестоком мире его произведения, с его подлостью и насмешками, с лицемерием и эгоизмом, сентиментальностью девушек. (2,157)

Свои первые романы «Une vie» (1883) и «Bel-Ami» (1885) он задумал как длинные истории с главным героем, чья история разворачивается от анекдота к анекдоту на фоне повседневной банальности. Героиня романа Une vie, похожая на его собственную мать, ведет одинокое и несчастное существование всегда мрачная, тоскливая. Жорж Дюруа по прозвищу Бел-Ами сделал блестящую и циничную карьеру в качестве журналиста используя женщин. Мопассан очень старался изобразить реальность своего времени - общество сельской местности Нормандии, а также среду прессы и политики. Романтическое изобретение тонкое, психология часто отрывочна. Все способствует пессимистическому видению, едва освещенному редким моментом чувствительности. Похоже, что Мопассан движется к натурализму без насилия или излишеств, что запечатлевает у автора романа «Воспитание чувств» Флобера чувство монотонного течения дней. (7,105)

Натурализм (фр.naturalisme; лат.natura – природа) – литературное направление, сложившееся в Европе и США в последней трети XIX в. Стремится к объективному, точному и бесстрастному изображению реальности и человеческого характера, обусловленного физиологической природой и средой, понимаемой преимущественно как непосредственное бытовое и материальное окружение, не исключающее социально-исторических факторов. Натуралисты изучают общество с той же полнотой, с какой естествоиспытатель изучает природу; для них характерно уподобление художественного познания научному подходу.

Натурализм зародился и программно оформился, прежде всего, во Франции. Огромную роль в формировании натурализма сыграли успехи естественных наук, например, физиологии, противопоставившей эксперимент «ненаучным» методам познания. Его философской основой стал позитивизм Огюста Конта, а эстетической - теория Ипполита Тэна.

Имея разочарованное представление о жизни Мопассан участвует в натуралистическом мировоззрении. Человек, у которого нет страсти, который ни во что не верит, который испытывает настоящую нежность только к своей матери и привязанность только к Флоберу, считает, что все разделено на скуку, фарс и страдание. Для него все сводится к «физическому наслаждению, любви как созерцанию пейзажа». Но его собственный опыт дает этому видению новую окраску. «Нельзя преувеличивать влияние Флобера на Мопассана. Избрав его своим духовным наследником он дает ему верительную грамоту в мир литературы. «Более молодой, чем вождь натурализма, Мопассан благодаря Флоберу, несмотря на возраст, становится в ряд равных ему». К этому следует добавить, что Мопассан, столь несхожий с Флобером, высоко и благодарно чтил его – горячее восхищение этим писателем составляет в нем самую привлекательную черту. (3,236)

Одержимость смертью, будучи чувствительным к первым работам, мучительное чувство человеческой беспомощности и особенно болезни, затем нарастающее безумие, которое он ясно видит в грядущем. После попытки самоубийства его разум тускнеет, и он проживет еще два с половиной года, чуждый себе и своей работе, в доме здоровья. (5,164)

Он отдаляется от натуралистов своими идеями о романе и произведении искусства, выраженными, в частности, в решающий момент его карьеры, в эссе, которое служит предисловием к роману *Пьер и*

*Жан*. *«Быть правдой»* состоит в том, чтобы дать полную иллюзию истины в соответствии с обычной логикой фактов, а не в том, чтобы рабски расшифровывать их в беспорядочной их последовательности... У каждого из нас есть иллюзия мира, поэтическая иллюзия, сентиментальная, радостная, меланхоличная, грязная или мрачная, в зависимости от его характера. И у писателя нет другой миссии, кроме как точно воспроизвести эту иллюзию всеми художественными процессами, которые он приобрел и которые он может использовать. (4, 306)

Мопассан не противопоставляется психологическому романисту, который ставит себя на место своих персонажей и, таким образом, заблуждается и нас вводит в заблуждение. Роман должен быть объективным, показывая только действия персонажей, не желая объяснять их мотивы. (4,301)

«Милый друг» - один из самых известных и канонических романов XIX в., законченный автором в 1885 году. Темой произведения стала знакомая по книгам писателей-романтиков Франсуа Рене де Шатобриана, Бенжамена Констана, Альфреда де Мюссе и писателей-реалистов Стендаля, Бальзака, Флобера судьба молодого человека, современника или alter ego (второй я) авторов.

Психология молодого героя, его внутренняя жизнь и реальные поступки подробно исследовались в литературе на протяжении всего XIX века. Анализ просто неудавшейся любви, семейного счастья у романтиков сменил рассказ о честолюбивых устремлениях и возможностях их реализации у писателей-реалистов. Мопассан в романе «Милый друг» рассказывает историю молодого человека, близкую к его собственной судьбе, как это, впрочем, в формальном выражении было и в других случаях, однако при этом он создает образ, приобретающий значение символа для последующей эпохи и на сегодня еще не завершившейся. Его книга – не роман о разрыве с ушедшим миром, не сожаление об утраченных иллюзиях, не история воспитания чувств, - это роман о становлении карьеры. Используя образ, как выражаются некоторые французские исследователи, «непроблематичности героя», идеального героя в полном смысле слова (hėros-maitre) победителя по физическим и умственным, исчерпывающим для данного окружения задаткам, автор сумел создать одну из зримых для конца XIX и всего XX века моделей карьеры.

Пресса, с точки зрения Мопассана, представляет собой необъятную республику, простирающуюся во все стороны, где все можно найти, все можно сделать, и где можно быть как честным человеком, так и мошенником. Мопассан сам немало лет служил в газетах и как репортер, и как журналист-очеркист, он сам писал, как его Жорж Дюруа, и об Африке, и о занятиях высшего общества. Арман Лану назвал свое литературное произведение-биографию о нем «Милый друг Мопассан» (Maupassant Bel-Ami). (1,9). Но это вовсе не означает, что Мопассан чем-то похож на своего героя, хотя он тоже уроженец Нормандии, любимец женского пола, знаток издательских коридоров и светских гостиных. Дюруа отличала беззастенчивость, пробивная сила вчерашнего военного родом из крестьян, ясность и примитивизм жизненной цели. Объединяет его с Мопассаном открытие и знание мира, в котором он живет и действует.

В тексте Les debuts de Georges Duroy мы застаем главного героя в тот момент, когда у него рождаются честолюбивые мечты о судьбе репортера, от которого зависят другие судьбы, другие карьеры. В этот вечер он еще не сумел сделать первого шага и написать свой первый текст, для которого все уже готово, даже название *ВОСПОМИНАНИЯ АФРИКАНСКОГО СТРЕЛКА* - “Souvenirs d’un chasseur d’Afrique” .

Дюруа думает, с чего начать свой «выдающийся» текст, и пишет вполне пристойно в духе документированной мемуаристики: «Это было в 1874 году, в середине мая, в то время, когда обессиленная Франция отдыхала от потрясений роковой годины…» “C’ėtait en 1874 aux environs du 15 mai, alors que la France ėpuisėe se reposait aprè s les catastrophes de l’annėe terrible”... Затем наступает затянувшаяся пауза – он не знает, как описать отправление в Алжир, само путешествие и свои первые впечатления: отплытие, путешествие, первые впечатления - l’embarquement; le voyage; les premiè res ėmotions.

Автор прекрасно передает процесс работы над статьей, разбивая ее на три части, - это свойственно не только начинающему журналисту. Красиво написать заголовок, да, в этом есть авторская ирония, но описать то, что более памятно и лучше может получиться, дать описание Алжира, - это уже обычная, свойственная любому пишущему работа, несущая, конечно, элемент штампа, но все же вполне самостоятельная, очеркистская , газетная: “Alger est une ville toute blanche…” «Алжир — город весь белый...» — написал он, но дальше этого дело не пошло. После долгих усилий он прибавил: «Часть его населения составляют арабы…» “…La ville est habitee par des arabes…” Потом швырнул перо и встал из-за стола.

Память вновь нарисовала перед ним красивый чистенький городок, ручейками домов с плоскими кровлями сбегающий по склону горы к морю, но он не находил слов, чтобы передать виденное и пережитое. (2,9) - la jolie citė Claire, dėgringolant comme une cascade de maisons plates, du haut de sa montagne dans la mer.

Об отъезде он напишет потом. Мопассан делает более насыщенным и читательски интересным внутренний монолог героя, в котором мы видим «пленительное своеобразие Алжира, этого преддверия Африки с ее таинственными дебрями, Африки кочевых арабов и безвестных негритянских племен… - Alger, cette antichambre de l'Afrique mysterieuse et profonde; l'Afrique des Arabes vagabonds et les Nè gres inconnus; Африки неисследованной и манящей, откуда в наши городские сады изредка попадают неправдоподобные, будто явившиеся из мира сказок животные: невиданные куры, именуемые страусами; наделенные божественной грацией козы, именуемые газелями; поражающие своей уродливостью жирафы, величавые верблюды, чудовищные гиппопотамы, безобразные носороги и, наконец, страшные братья человека — гориллы. - "l'Afrique inexplorėe et tentante…; les bētes invraisemblables qui semblent crėės pour des contes de fėes, les autruches, ces poules extravagantes, les gazelles, ces chè vres divines, les girafes surprenantes et grotesques, les chameaux graves, les hippopotames monstrueux, les rhinocėros informes, et les gorilles, ces frè res effrayants de l'homme".

Мопассан демонстрирует текст в тексте, передает мыслительный процесс своего решительного героя.

Полное впечатление о герое автор составляет, показывая **место,** в котором он живет: «Семиэтажный дом, где он снимал комнату, был населен двумя десятками семей рабочих и мещан» - Sa maison, haute de six ėtages... peuplėe par vingt petits mėnages ouvriers et bourgeois...; «Грязные ступеньки, усеянные очистками, окурками, клочками бумаги» - L'escalier, les marches sales ou trainaient des bouts de papiers, des bouts de cigarettes, des ėpluchures de cuisine; «Тяжелый запах остатков пищи, отхожих мест и человеческого жилья» - Une odeur lourde de nourriture, de fosse d'aisance et d'humanitė.

**Одежду,** которую он носит: ses habits de tous les jours....vides, fatigues, flasques, vilains comme les hardes de la Morgue; son chapeau de soie, semblant ouvertpour recevoir l'aumone. – «На узкой железной кровати, на которой от тяжести его тела образовалась впадина, валялось его будничное платье, поношенное, измятое, скомканное, всем своим отвратительным видом напоминавшее отрепья из морга. А шелковый цилиндр, его единственный цилиндр, лежавший вверх дном на соломенном кресле, точно ждал, чтобы ему подали милостыню».

**Отсутствие денег -…** et ses yeux ėtant tombės sur la note de sa blanchisseuse, montėe, le soir mēme, par le conciè rge, il fut saisi brusquement par un dėsespoir ėperdu. – «Тут ему попался на глаза счет от прачки, сегодня вечером принесенный швейцаром, и безысходная тоска охватила его. Радость исчезла вмиг — вместе с верой в себя и надеждой на будущее. Кончено, все кончено, он ничего не умеет делать, из него ничего не выйдет. Он казался себе человеком ничтожным, бездарным, обреченным, ненужным».

**Чувство контраста - «**Дюруа свернул на улицу Бурсо, на которой он жил. Поднимаясь по лестнице и освещая восковыми спичками он вместе с болезненным отвращением испытывал острое желание вырваться отсюда и поселиться там, где живут богатые люди, — в чистых, устланных коврами комнатах. Здесь же все было пропитано, застарелым запахом пыли и плесени, запахом, который никакие сквозняки не могли выветрить». - il se voit dans les logis des gens riches, en demeurs propres, avec des tapis…

Автор в своем творчестве должен быть похож на Бога во Вселенной, присутствующего повсюду и нигде не видимого ... Декор способен раскрыть нам важные черты характера автора-натуралиста. Ги де Мопассан - один из самых выдающихся натуралистов, который умеет сочинять и описывать свой декор. Его натурализм подтолкнул его к очень точным указаниям местностей, которые он описывает нам в своих романах и в своих коротких рассказах, чтобы у нас была возможность отметить, соответствует ли его описание реальности, если он дает нам свои впечатления художественно или нет, то есть работает ли он как художник или как фотограф. Мы различаем: 1. элементы, которые появляются в декоре: атмосфера, свет, небесные тела; 2. специальные описания, то есть пейзажи, здания и т. д., обозначенные их именами, в которых Ги де Мопассан пытается дать нам представление о существующей местности: идея вкуса для самого писателя; программа натуралиста. (3,10)

Этот отрывок из книги датского литературоведа Л.Жансена содержит методические указания к анализу окружающей обстановки, предметов, интерьера и пейзажей, позволяющих раскрыть как внутренний мир писателя, так и связь с его программными требованиями. Эти методологические требования позволяют сделать продуктивным прочтение даже маленького отрывка произведения.

Таким образом, мы наблюдаем героя в период становления – между одним его состоянием, нерешительности, и другим, не ставшим еще реальностью, состоянием благополучия. С помощью автора мы обнаружили, даже ощутили героя, Дюруа, между двумя его состояниями – бедного, начинающего репортера и будущего известного и влиятельного журналиста.

**Литература**

1. Лану Арман. «Мопассан». М.: Молодая гвардия. ЖЗЛ. 1971.
2. Мопассан ги Де. Том 3. Роман «Милый друг», стр.256
3. Моруа А. 6 том. Москва. Издательство «Пресса» 1992
4. Тимашева О.В. Опыт «пристального чтения» романа Мопассана «Милый друг» // Вопросы филологии, 2000, №2.
5. Brenner J. Mon histoire de la littėrature franç aise contemporaine. P., Grasset, 1987.
6. Luplau-Janssen. Le décor chez Maupassant. Copenhague, 1960
7. Moreau P. La critique littėraire en France. Paris, 1960
8. Pouillon Jean. Temps et Roman. Paris, 1946
9. Интернет ресурс – knijky.ru |books| milyy - drug

**Jorj Düruanın karyerasının başlanğıcı (Gi de Maupassanın "Əziz dost" romanı əsasında)**
**Xülasə**

"Əziz dost" XIXcu əsrin məşhur və kanonik romanlarından biridir, müəllif tərəfindən 1885-ci ildə tamamlanmışdır. Əsərin mövzusu müəllifin çağdaş bir gəncin taleyi idi. Düruanın həyatı öz taleyinə yaxındır. Onun da doğma vətəni Normandiyadır, qadınların sevimlisi, nəşr dəhlizlərinin bilicisidir, lakin Dürua abırsız, həyata baxışı daha da aydın və məqsədinə çatmaqda çevik idi. Bu obraz sonrakı dövr üçün bir simvola çevrilir.

**Beginning of the career of Georges Durois (based on Guy de Maupassant's novel "Dear Friend")**
**Summary**

"Dear Friend" is one of the famous and canonical novels of the 19th century, completed by the author in 1885. The theme of the work was the fate of a young man, a contemporary of the author. The history of Durois is close to his own fate He is also a native of Normandy, a female favorite, a connoisseur of publishing corridors, but Durois was distinguished by his shamelessness, clarity and primitivism of his life's goal, which acquires the significance of a symbol for the next era.

**Rəyçi: prof. N.Məmmədxanova**

Göndərilib: 10.06.2020 Qəbul edilib: 13.06.2020

DOI: 10.36719/AEM/2007-2020/55/63-66

**Şəfəq Binyamin qızı Cəfərova**
Bakı Dövlət Universiteti
şefeq-ceferova-91@mail.ru

# AZƏRBAYCAN DASTANLARININ DİLİNDƏ TABELİ MÜRƏKKƏB CÜMLƏLƏRİN STRUKTUR-SEMANTİK TƏHLİLİ

***Açar sözlər:*** *Azərbaycan dastanları, sintaktik konstruksiya, tabeli mürəkkəb cümlə, semantika, struktur əlaqə*
***Key words****: Azerbaijani dastans, syntactic construction, complex sentence, semantics, structural link*
***Ключевые слова****: азербайджанские дастаны, синтаксическая конструкция, сложноподчиненное предложение, семантика, структурная связь*

## Giriş

Azərbaycan dastanlarının dilində tabeli mürəkkəb cümlə konstruksiyalarına kifayət qədər rast gəlmək olur. Bildiyimiz kimi, tabeli mürəkkəb cümlələr baş və budaq cümlələrdən ibarət olur. Baş cümlələr öz qrammatik vəziyyətinə görə sərbəst, budaq cümlələr isə ondan asılı olur. Tabeli mürəkkəb cümlələr ən azı iki cümlənin tabelilik əlaqəsi ilə birləşməsindən yaranır. Çünki tabeli mürəkkəb cümlənin komponentlərindən biri və ya hər ikisi sadə cümlələrdən, eyni zamanda tabesiz mürəkkəb cümlələrdən, hətta tabeli mürəkkəb cümlələrdən ibarət ola bilir. Qarışıq tipli tabeli mürəkkəb cümlələri yadımıza salsaq, bu fikrin təsdiqini tapmış oluruq. Qeyd etmək lazımdır ki, baş cümlənin müstəqilliyi nisbi müstəqillikdir. Tabeli mürəkkəb cümlələrin budaq cümlələrinə görə təsnifi dilçilikdə böyük mübahisələrə yol açıb. Budaq cümlənin növləri haqqında müxtəlif dilçilər fərqli fikirlər səsləndiriblər.

Tabeli mürəkkəb cümlənin növləri budaq cümlənin növlərinə görə müəyyən edilir, yəni tabeli mürəkkəb cümlələrin tərkibində nə cür budaq cümlə varsa, o həmin növdən hesab edilir. Budaq cümlənin növü tabeli mürəkkəb cümlənin növünü müəyyənləşdirir. Azərbaycan dilinə aid yazılmış dərsliklərdə budaq cümlənin növü və miqdarı müxtəlif göstərilmişdir. Bu bölgü asılı cümlənin baş cümləyə münasibətində sintaktik funksiyası ilə əlaqədardır. Bəzi dövrlərdə Azərbaycan dilçiləri budaq cümlənin sayını 8, bəzi dövrlərdə 7, bəzi dövrlərdə 12-yə çatdırdılar. 1952-ci ildə dilçilikdə yeni bir addım atılır. Belə ki, bu tarixə qədər subyekti olan feili bağlama, qoşmalı feili sifət, məsdər tərkibləri də budaq cümlə kimi qəbul olunurdusa, 1952-ci ildən sonra bu prinsip sıradan çıxarılır və onlar cümlə üzvü hesab olunur.

Dilçiliyimizdə budaq cümlələrin növü haqqında mübahisəli fikirlər olsa da, bu gün çağdaş Azərbaycan dilində budaq cümlələrin miqdarı 15-dir. Tabeli mürəkkəb cümlələrin struktur cəhətdən digər təsnifi budaq cümlənin işlənmə yerinə görədir (budaq cümlənin baş cümlədən əvvəl və sonra gəlməsi). Tabeli mürəkkəb cümlələrdə birinci bölgü prinsipi funksiol-semantik bölgü hesab olunur. Azərbaycan dastanlarının dilində tabeli mürəkkəb cümlələrin hər bir təsnifinə uyğun nümunlər var. Ədəbi dillə üst-üstə düşən konstruksiyalardan əlavə canlı danışıq dilinə uyğun gələn cümlə tipləri də var:

*Mən sənə deyirəm ki, özünü itirmə, nə dəsə, deynən anamsan, bacımsan, nə sorussa, deynən anamsan, bacımsan ("Məhəmməd və Güləndam" dastanı).* Məhəbbət dastanından götürülmüş sintaktik konstruksiya qarışıq tipli tabeli mürəkkəb cümlə strukturuna sahibdir. Onu da qeyd etmək lazımdır ki, gündəlik məişət ünsiyyətimizdə daha çox lokanizmə meyilli olsaq da, bu tip mürəkkəb struktura malik cümlələrdən də istifadə edirik. Dastan dilində xalq danışıq dilinə xas olan leksik nümunələrə tez-tez rast gəlinir. Bunlardan biri də yuxarıda təqdim etdiyimiz sintaktik konstruksiyada mövcuddur (deynən). Xatırladaq ki, həmin leksik vahid üzərində olan şəkilçi morfem hal-hazırda dialekt ünsürüdür.

Sintaktik konstruksiya baş cümlə ilə başlayır *(mən sənə deyirəm ki)* və özündən sonra gələn budaq cümlə *(özünü itirmə, nə dəsə, deynən anamsan, bacımsan, nə sorussa, deynən anamsan, bacımsan)* ilə "ki" bağlayıcısı ilə qrammatik əlaqələnməsi var. Budaq cümlə baş cümlənin semantik cəhətən obyekti qismində çıxış edir və cümlə funksional-semantik bölgüyə görə tamamlıq budaq cümli tabeli mürəkkəb cümlə hesab olunur. Budaq cümlənin özü də iki tabeli mürəkkəb cümlədən ibarətdir (*...özünü itirmə, nə dəsə, deynən anamsan, bacımsan, nə sorussa, deynən anamsan, bacımsan).* İki cümlənin hər biri şərt semantikası ilə əlaqənib. Cümlənin əvvəlində olan "*özünü itirmə"* ifadəsi sonrakı tabeli mürəkkəb cümləyə də aiddir və ellipsisə uğrayıb. *(özünü itirmə, nə dəsə, deynən anamsan, bacımsan, özünü itirmə nə sorussa, deynən anamsan, bacımsan)* Cümlənin daxilində də gizli tabeli mürəkkəb cümlə də var *(deynən anamsan, bacımsan)* bu cümlənin daxilində də "ki" başlayıcısı bərpa oluna bilər.

Bildiyimiz kimi dildə inkişaf iki cür gedir.

1. Mürəkkəb quruluşdan sadələşməyə doğru.

2. Sadə quruluşdan mürəkkəbləşməyə doğru.

Dilin sintaktik səviyyəsində birinci halda qarışıq tipli tabeli mürəkkəb cümlələr, ikinci halda isə tabeli mürəkkəb cümlənin natamam formaları yaranır. Azərbaycan dastanlarının dilində hər iki formaya aid nümunələr mövcuddur. Ümumilikdə nəzərə çatdırmaq lazımdır ki, dastanlarımızın dili xalq danışıq dilinə və şifahi dilə daha çox uyğun gəlir. Dastan dilində qarışıq tipli tabeli mürəkkəb cümlə nümunələri var:

*Hər yerdə deyilirdi ki, Dəli Mahmudun qəhvəxanasına Təbrizdən bir aşıq gəlib ki, elə gözəl oxuyur, deyirsən, bülbül cəh-cəh vurub zəngulə çəkir(“Aşıq Qərib və Şahsənəm” dastanı).*

Şifahi dilə uyğun qrammatik quruluşa malik olan bir nümünə ilə qarşılaşırıq. Cümlənin birinci komponentinə sonrakı komponentlər ümumu halda mübtəda budaq cümləsi şəklində bağlanıb və sual ilk komponentdən yaranır. (H*ər yerdə deyilirdi ,.... NƏ?...).* İkinci komponentdən sonra cümlənin struktur – semantik durumu mürəkkəbləşir.

*Dəli Mahmudun qəhvəxanasına Təbrizdən bir aşıq gəlib, elə gözəl oxuyur...*

İkinci komponentlə üçüncü komponentin arasında təyinedicilik semantikası var, yəni sintaktik konstruksiyanın bu hissəsini təyin budaq cümləli tabeli mürəkkəb cümlə adlandırmaq olar. Sintaktik konstruksiyanın bu komponentini ayrıca sadələşdirək:

*Dəli Mahmudun qəhvəxanasına Təbrizdən gözəl oxuyan aşıq gəlib.*

Sonrakı komponentinin, yəni sintaktik konstruksiyanın dördüncü hissəsinin üçüncü komponentdəki təyinedici hissənin-budaq cümlənin bənzətmə-müqayisə semantikası ilə tamamlandığını görürük:

*....Elə gözəl oxuyur, deyirsən, bülbül cəh-cəh vurub zəngulə çəkir.*

Komponentləri bağlayan *“deyirsən”* sözü baş cümlə kimi görünsə də, fikrimizcə, bu nümunədə sintaktik konstruksiyanın ümumi semantik-məna münasibətini nəzərə aldığımız zaman həmin sözün tabeli mürəkkəb cümlənin baş cümləsi kimi yox, ara söz səviyyəsində istifadə edildiyini görürük. Digər bir tərəfdən, əgər cümlə səviyyəsində olduğunu düşünsək, o zaman cümlənin ifadə etdiyi məna tamamilə fərqli olur və bu zaman sintaktik konstruksiyanın komponentləri arasında semantik əlaqə itir. Bu kimi hallar dastan dilində kifayət qədərdir və bu kimi sintaktik konstruksiyaların yaranmasına səbəb baş cümlənin transformasiyaya uğraması hadisəsi olur. Konstruksiya daxilində istifadə edilən “deyirsən” sözü “sanki”, “elə bil” bənzətmə semantikasına sahib olan modal sözləri xatırladır. “Zaman keçdikcə danışıqda bu cəhət daha da inkişaf edir, baş cümlə olmaq keyfiyyəti yavaş-yavaş azalır, münasibət ifadə etmək keyfiyyəti çoxalır və nəhayət , üstün gəlir. (2;401) Sonuncu komponentin tabeli mürəkkəb cümlə olduğunu düşünərək nümunəni təhlil edək:

*...Deyirsən, bülbül cəh-cəh vurub zəngulə çəkir.*

Nümunəyə müstəqil halda baxdıqda sintaktik konstruksiyanın tamamlıq budaq cümləli tabeli mürəkkəb cümlə olduğu heç bir şübhə doğurmur. Cümlənin sadələşmiş formasına baxaq:

*Bülbülün cəh-cəh vurub zəngulə çəkdiyini deyirsən.*

Doğrudan da, cümləyə bu şəkildə nəzər yetiriyimiz zaman cümlənin ümumi sintaktik konstruksiyanın ifadə etdiyi məna çalarından tamamilə fərqli semantikaya malik olduğu aydın görünür. Dastanlarımızın dilində bu kimi nümunələr daha çoxdur və təbii ki, bunun səbəbi dastan dilinin ədəbi dildən daha çox şifahi dilə uyğun gəlməsidir.

“Kitabi-Dədə Qorqud” dastanı ədəbiyyatımız üçün nə qədər mühüm dəyərə sahibdirsə, dilimizin qədim çalarlarını özündə mühafizə etdiyi üçün bir o qədər də Azərbaycan dilçiliyi üçün önəmlidir. Dastan dilində tabeli mürəkkəb cümlə konstruksiyaları vasitəsiz nitqlə daha çox təqdim olunur. Bu da digər dastanların dilindən fərqli xüsusiyyətdir, çünki digər dastanlarımızın dilində həmin cümlə konstruksiyaları “ki” bağlayıcısı ilə əlaqələndirilir və tabeli mürəkkəb cümlənin baş cümləsi kimi verilir. Dastanın dilində baş cümlənin hər bir struktur-semantik nümunəsinə rast gəlmək olur. Baş cümlə ilə budaq cümlənin yeri üslub gərəyi bəzən dəyişdirilir. Yəni strukturuna görə baş cümlə budaq cümlədən sonra gəlməlidirsə, inversiya ilə budaq cümlə baş cümlədən önə keçirilir və əksinə. Maraqlıdır ki, xalq danışıq dilində bu kimi hallar daha çox istifadə olunur. Nümunəyə baxaq:

*Təkur aydır:“Bu yigidin sözi yügrək, əgər əlində hünəri var isə”.*

Müasir Azərbaycan ədəbi dilində “əgər” şərt bağlayıcısı budaq cümlədə işlənir və həmin budaq cümlənin xəbərində isə (-sa,-sə) hissəciyi ya verilir, ya da asanlıqla bərpa oluna bilir. Bu zaman dilin qrammatik tələbinə uyğun olaraq budaq cümlə baş cümlədən sonra işlənir. Lakin gördüyümüz kimi, nümunədə cümlədə qrammatik qayda-qanunlar yerində saxlanılsa da, sadəcə baş cümlə ilə budaq cümlənin yeri daha emosional nitq təqdimi üçün dəyişdirilmişdir. Cümlənin inveriyasını ləğv edərək baxaq:

*Təkur aydır: “Əgər əlində hünəri var isə, bu yigidin sözi yügrəkdir”.*

İki nümunəni müqayisə edək. Struktur cəhətdən dəyişdirilən cümlələrin semantikası şərt məzmunu ilə eyni şəkildə qalsa da, birinci cümlədə semantika daha güclu və tutarlıdır, ikinci cümlədə isə daha zəifdir, sanki cümlədə semantik bağ qırılır.

Dastan dilində nəzərə çarpan tendensiyalardan biri də qənaət meyilidir. Dilin inkişafi ilə əlaqədar dildə mürəkkəb cümlələrin qrammatik və semantik cəhətdən mürəkkəb formaları yaranır, eyni zamanda həmçinin sadələşməyə aparan qənaət prinsipi də mövcuddur. Dildə bu qənaət prinsipi ellipsis hadisəsi hesabına yaranır. Dilin müxtəlif səviyyələrində bu dil hadisəsi özünü biruzə verir. “Sintaksisdə qənaət meylinə söz birləşmələrinin tərəfləri və cümlə üzvlərinin ixtisarı formasına təsadüf edirik”. (13; 78) Ədəbi dillə müqayisədə canlı danışıq dilində ellipsis hadisəsinə daha çox rast gəlinir. Sözügedən dil hadisəsi qrammatik quruluşu dəyişir. Əslində semantik cəhətdən sadə və mürəkkəb cümlələr arasında çox böyük fərq yoxdur, informativ cəhətdən hər iki quruluş eyni ola bilər. Struktur cəhətdən mürəkkəb cümlə ilə sadə cümlə arasında böyük fərq olsa da, semantik cəhətən fərq o qədər də böyük olmaya bilər.

İnformasiya ilə semantika yükü hər zaman eyni deyil. Ellipsisə uğrayan sintaktik konstruksiyanın lazımsız hesab olunan hissəsi onun informasiya yükünü azaldır, lakin sematik cəhətdən bir dəyişiklik getmir, yəni gizlənmiş hissə semantik cəhətdən yenə də məlum olur.

“Tabeli mürəkkəb cümlənin elliptik forması o konstruksiyalara deyilir ki, onlar əslən mürəkkəb quruluşlu olsalar da, daha mürəkkəb informativ yükə malik olsalar da, sonradan onlardakı ellipsis, yəni baş və ya budaq cümlənin hər hansı birinin işlədilməməsi onlarda istər struktur, istərsə də semantik baxımdan natamamlıq ilk baxışda hiss olunmur”. (11;125) Cümlənin quruluşca bütün formalarında ixtisarlar mümkündür. Azərbyacan dastanlarının dilində tabeli mürəkkəb cümlə konstruksiyalarında ixtisarlar var. Bu daha öncə də qeyd etdiyimiz kimi dastan dilinin şifahi dillə uyğunluğu ilə bağlıdır. Nümunələrə baxaq:

*Alı xan irəli yeriyib, kağızı aldı, elə belə baxdı, pərinin dəsti-xəttidir. (“Alı xan və Pəri” dastanı).*

İlk baxışda sintaktik konstruksiyada bir natamamlıq nəzərə çarpmır. Lakin cümləyə diqqətlə baxdığımız zaman konstruksiyadan baş cümlənin ixtisar olunduğunu görürük.

*Alı xan irəli yeriyib, kağızı aldı, elə belə baxdı, gördü ki, pərinin dəsti-xəttidir.*

Sintaktik konstruksiyadan “*gördü ki*” baş cümləsi əslində ixtisar olunmuşdur.

Dastan dilində dialoqlarda maraqlı cümlə strukturları var. Nümunəyə baxaq:

*...Kişi belə dedikdə Sayat xanım öz-özün dedi.*
*-Əgər mənim yuxuda gördüyüm, badəsini içdiyim bu Əmrah isə...*
*Kişidən adını doğru söyləməsini tələb etdikdə yenə kişi dedi:*
*-Əmrahdı.*
*Sayat xanım ürəyində dedi:*
*-Mənə lazım deyil.* (“Əzəmətli Əmrah” dastanı)

Dialoq daxilində tabeli mürəkkəb cümlə iki yarımçıq cümlə strukturunda təqdim olunub. Budaq cümlə dialoqun əvvəlində verildiyi halda, daha sonra fikir yarımçıq saxlanılır və informasiya dioloqun sonunda tamamlanır. Dialoqun son cümləsi sadə cümlə kimi görünsə də, dialoqun əvvəlində verilən budaq cümlənin ixtisar olunmuş baş cümləsidir:

*...Kişi belə dedikdə Sayat xanım öz-özünə dedi.*
-*Əgər mənim yuxuda gördüyüm, badəsini içdiyim bu Əmrah isə...*
*Kişidən adını doğru söyləməsini tələb etdikdə yenə kişi dedi:*
*-Əmrahdı.*
*Sayat xanım ürəyində dedi:*
-*Mənə lazım deyil.*

Dialoqda komponentlər ayrı-ayrı təqdim olunursa da, əslində ikinci komponent birincinin məchul subyektidir, yəni nümunə mübtəda budaq cümləli tabeli mürəkkəb cümlədir. Bu nümunədə sintaktik konstruksiya həm struktur, həm də semantik cəhətdən parçalanmış formada təqdim olunumuşdur.

Azərbaycan ədəbi dilinin və xalq danışıq dilinin vəhdətində yaranan dastan dili Azərbyacan türkcəsinin bütün incəliklərinə sahibdir. Tabeli mürəkkəb cümlənin bütün struktur və semantik xüsusiyyətlərini özündə cəmləşdirən sintaktik konstruksiyalar mövcuddur.

## Ədəbiyyat

1. Abdullayev Ə.Z. “Kitabi-Dədə-Qorqud” dastanlarında tabeli mürəkkəb cümlələr” // ADU-nun elmi əsərləri (dil və ədəbiyyat seriyası), 1975. № 2.
2. Abdullayev Ə.Z. Müasir Azərbaycan dilində tabeli mürəkkəb cümlələr. Bakı: “Maarif” nəşriyyatı. 1974.
3. Abdullayev Ə.Z., Seyidov Y., Həsənov A. Müasir Azərbaycan dili, IV hissə. Sintaksis. Bakı: “Şərq-Qərb” nəşriyyatı, 2007.
4. Azərbaycan xalq dastanları. II cild. Bakı: Azərbaycan dövlət nəşriyyatı, 1961.
5. Azərbaycan məhəbbət dastanları. Bakı: «Elm» nəşriyyatı, 1979.
6. Azərbaycan məhəbbət dastanları. Bakı: Yazıçı, 1980.

7. Cəlilov B.A. Azərbaycan dilində qoşulma konstruksiyalar. "Azərbaycan dilində tabeli mürəkkəb cümlə məsələlər" kitabı. ADU nəşriyyatı. Bakı, 1982.
8. Dəmirçizadə Ə. "Kitabi-Dədə-Qorqud" dastanlarının dili. Bakı: APİ nəşriyyatı. 1959.
9. Hacıyev T.İ. Azərbaycan ədəbi dilinin tarixi. I cild. Bakı: "Elm" nəşriyyatı. 2012.
10. Müasir Azərbaycan dili. Sintaksis. IV cild. (Dərslik). Bakı: «Şərq-Qərb» nəşriyyatı, 2007.
11. Müzəffəroğlu T. Müasir Azərbaycan dilində mürəkkəb cümlənin struktur semantikası. Bakı: Azərnəşr, 2002
12. Vəliyev K.N. Dastan poetikası. Bakı: "Yazıçı" nəşriyyatı, 1984.
13. Yusifov M. Morfoloji və sintaktik kateqoriyalarında qənaət meyli // ADU-nun elmi əsərləri (dil və ədəbiyyat seriyası). Bakı: 1975.

### The structural-semantic analysis of the complex sentences in the language of Azerbaijani dastans

**Summary**

The article contains the structural-semantic analysis of the complex sentences in the language of Azerbaijani dastans which are a part of the common Turkic folklore. It is known that creation and distribution of the folklore samples take place in the oral form; however, when publishing these literary-artistic samples they must conform to the literary language. So the language of Azerbaijani dastans combines the peculiarities of both the literary and conversational languages. There are forms of the development in the syntactic layer of the language of Azerbaijani dastans which conform to the history of creation of the concrete dastan. Although simple sentences are used in the language of dastans more often the examples of use of the differrent structural-semantic types of the complex sentence occur, too. It is noted that mixed types of the complex sentence appeared in the language of Azerbaijani dastans during the process of the development to complication, but incomplete forms of the complex sentence emerged during the process of the development to simplification.

Our research shows that there are certain structural similarities and differences between the constructions of the complex sentence in the language of dastans and in the modern Azerbaijani language. Emergence of the constructions with the different structure and type of the semantic link during the process of the historical development of the language is quite natural. The analysis carried out shows that the language of Azerbaijani dastans contains the syntactic constructions which are more typical for the modern conversational language than for the literary language.

### Структурно-семантический анализ сложноподчиненных предложений в языке азербайджанских дастанов

**Резюме**

В статье на основе конкретных примеров и фактов проводится структурно-семантический анализ сложноподчиненных предложений в языке азербайджанских дастанов, являющихся составной частью общетюркского фольклора. Известно, что создание и распространение образцов фольклора происходит в устной форме, тем не менее при издании эти литературно- художественные образцы должны соответствовать литературному языку. По этой причине язык азербайджанских дастанов объединяет в себе особенности как литературного, так и живого разговорного языка. В синтаксическом пласте языка дастанов имеются формы развития, соответствующие истории создания данного дастана. Хотя в языке дастанов чаще всего употребляются простые предложения, однако встречаются и примеры использования различных структурно-семантических типов сложноподчиненных предложений. Отмечается, что в языке дастанов в процессе развития к усложнению на синтаксическом уровне образовались сложноподчиненные предложения смешанного типа, в процессе же развития к упрощению образовались неполные формы сложноподчиненных предложений.

Как показало наше исследование, между конструкциями сложноподчиненных предложений в языке дастанов и в современном азербайджанском языке имеются определенные структурные сходства и различия. Появление конструкций с различной структурой и типом семантической связи в процессе исторического развития языка вполне закономерно. Проведенный нами анализ показал, что в языке азербайджанских дастанов встречаются синтаксические конструкции, более характерные современной разговорной речи, нежели литературному языку.

**Rəyçi: prof. S.Abdullayeva**

Göndərilib: 20.06.2020 Qəbul edilib: 22.06.2020

DOI: 10.36719/AEM/2007-2020/55/67-70

**Arzu Məsim qızı Mədətova**
Azərbaycan Universiteti
arzu.d96@mail.ru

# İNGİLİS VƏ AZƏRBAYCAN DİLLƏRİNDƏ İŞLƏNƏN FRAZEOLOJİ VAHİDLƏRİN KONTRASTİV TƏHLİLİ

***Açar sözlər:*** *ingilis dili, Azərbaycan dili, frazeoloju vahidlər, kontrastiv təhlil*
***Key words****: English, Azerbaijani, phraseological units, contrast analysis*
***Ключевые слова****: английский язык, азербайджанский язык, фразеологические единицы, контрастивный анализ*

## Giriş

Müxtəlif sistemli dillərdə eyni kateqoriyadan olan vahidlərin qarşılıqlarının müəyyənləşdirilməsi ilk növbədə bu vahidlər arasında uyğunluqlar və uyğunsuzluqları aydınlaşdırmağı tələb edir. Kontrastiv tədqiqatlar belə dillərdə qarşılaşdırıla və ya bir-birini əvəz edə biləcək vahidləri müəyyənləşdirməyə imkan verir.

Hər bir dilin lüğət fondunda frazeoloji ifadələr özünəməxsus yer tutur. Onların qarşılaşdırılmasında bir sıra cəhətlərə xüsusi diqqət yetirilməsi lazım gəlir. Qeyd etmək lazımdır ki, frazeoloji ifadələr müxtəlif sistemə malik olan dillərdə əsasən fərqli struktura və semantikaya malik olsa da, onların bir qismində müəyyən uyğunluq, yaxınlıq da müşahidə edilir.

Semantikası və strukturuna görə uyğun gələn frazeoloji ifadələr müəyyən qrup təşkil edir. Müxtəlif dillərin materialları əsasında aparılmış tədqiqatlardan aydın olur ki, uyğunluqlar ya yalnız semantikaya, ya yalnız struktura, ya da həm semantika, həm də struktura görə ola bilər. Məsələn, ingilis dilində *to take oneself in hand,* Azərbaycan dilində *özünü ələ almaq,* rus dilində *взять себя в руки,* ingilis dilində *to shut one's eyes,* Azərbaycan dilində *göz yummaq,* rus dilində *закрывать глаза* birləşmələrində komponentlərin və mənanın eyniliyi diqqəti cəlb edir. Sintaktik baxımdan müxtəlif sistemə malik dillərə aid olan birləşmələrdə oxşar komponentlərin sıralanmasında fərq aydın görünür. Bu fərq müvafiq dilin sintaktik xüsusiyyətləri, sintaktik normaları ilə bağlıdır və əhəmiyyətli rol oynamır, yəni frazeoloji ifadələrin komponentlərinin sıralanması onların məna və komponent oxşarlığına heç bir təsir göstərmir.

Bu və ya digər sözün birləşmədəki ətrafı, distributiv imkanları onun mənasına müəyyən təsir göstərir. Sözün birləşmədəki mənası onun lüğəvi mənasından əsaslı şəkildə fərqlənə bilər. Bu, frazeoloji ifadələr üçün daha səciyyəvidir. Müəyyən dilə aid frazeoloji ifadələrin başqa dilə tərcüməsi və ya transformasiyası tərcüməşünaslığın həll etməli olduğu mühüm problemlər sırasına daxildir.

Bu və ya digər əşyaya ( kəmiyyətə) bərabər tutulan, hər hansı cəhətdən ona uyğun gələn, onu əvəz və ya ifadə edə bilən əşya (kəmiyyət) bir-birinə ekvivalent sayılır. Bədii tərcümədə belə bərabərqiymətliliyi təmin etmək çətindir, çünki tərcümə zamanı mənbə dilin sistemi ilə tərcümənin edildiyi dilin sistemi arasındakı fərqlər orijinalın məzmununun tam saxlanması imkanını məhdudlaşdırır. Ekvivalentliyi müəyyənləşdirmək üçün meyar rolunu orijinaldakı məna elementiərinin saxlanması oynayır. Bunu əsas götürərək V.Komissarov ekvivalentliyin beş tipini fərqləndirir: 1) tərcümə materialında orijinaldakı məzmun saxlanır; 2) orijinalın və tərcümə olunmuş materialın ümumi məzmunu eyni kommunikasiya məqsədini güdməklə yanaşı, eyni dilxarici situasiyanı əks etdirir; 3) leksik tərkibdə və sintaktik strukturda paralellər olur; 4) sintaktik struktur qorunur; 5) orijinalla tərcümə olunmuş material arasında maksimal yaxınlıq olur [2, c.52-56]. Əslində, beşinci tip ekvivalentlik anlayışının təyin edilməsi ilə bağlıdır. Burada ekvivalentliyin sərhədləndirilməsində müəyyən qədər yaxınlıq vardır. Maksimal yaxınlığı qiymətləndirmə vasitəsi və ya meyarı yoxdur. Ona görə də frazeoloji ifadələrin transformasiyası zamanı maksimal yaxınlıq adı altında ekvivalentlikdən danışmaq özünü doğrultmur.

Müxtəlifsistemli dillərin frazeoloji ifadələrinin bir-biri ilə uyğun gəlməsi halları az deyildir. Frazeoloji ifadələrin başqa dilə hərfi tərcüməsi mübahisə doğuran bir məsələdir. Bu məsələyə bir çox tədqiqatçılar münasibət bildirmişlər. Onlar arasında həm hərfı tərcüməni rədd edənlər, həm də bir sıra frazeoloji ifadələr üçün qəbul edənlər, həm hərfı tərcümədən, həm də transformasiyadan istifadə etməyin tərəfdarları olanlar vardır. Bəzi müəlliflər frazeoloji ifadələrin hərfi tərcüməsinin qeyri-mümkünlüyünü dillərin milliliyi ilə əlaqələndirmirlər. Bəzi dilçilər isə, əksinə, bu əlaməti dilin milli xüsusiyyətində görürlər. Məsələn,

S.Murtuzayev yazır: "... ümumiyyətlə, dünya dillərinin frazeologiyasına aid bir xüsusiyyət kimi, tərcümə oluna bilməmək Azərbaycan dilinə də aiddir" [3, s.28].

Frazeoloji ifadələrdə millilik güclüdür. Frazeoloji ifadələrin onların aid olduqları dilin daşıyıcılarının dünyagörüşü, təsəvvürləri, ətraf mühitə münasibəti, etnik-fəlsəfi baxışları, məişəti, təfəkkür tərzi və s. ilə bağlılığını qeyd edən S.Əliyeva göstərir ki, frazeoloji ifadələrin başqa dilə hərfən tərcümə oluna bilməməsi də əsasən bununla bağlıdır. Onun fıkrinə görə, frazeoloji vahidlərin hərfı tərcüməsi prosesində leksik-semantik baxımdan bir sıra çətinliklər ortaya çıxır. Frazeoloji ifadələrinin tərcümə oluna bilməməsi faktı özünü daha çox doğruldur. Əksərən onlar ya ekvivalentilə əvəzlənir, ya da leksemlərlə verilir [1, s.102].

İngilis və Azərbaycan dillərində işlənən frazeoloji vahidlərin kontrastiv təhlili onların struktur cəhətdən oxşar və fərqli cəhətlərini aşkara çıxarmağa, ingilis dilindən Azərbaycan dilinə tərcümə prosesində ortaya çıxan bir sıra məsələlərə aydınlıq gətirməyə imkan verir. A.B.Kunin, M.N.Amosova, Y.I.Retsker, T.Q.Levitskaya, A.F.Fiterman, A.V.Fyodorov, V.N.Krupnov və başqalarının tədqiqatlarında da gəstərildiyi kimi, ingilis frazeoloji vahidlərinin başqa dillərə tərcüməsi mühüm linqvistik problemlərdəndir. Bu sahədə müəyyən işlər görülsə də, bir sıra vacib məsələlərin həllinə hələ də ehtiyac duyulmaqdadır.

Məlumdur ki, başqa dillər kimi, ingilis dilinin də frazeoloji sistemi bu dilin milli özünəməxsusluğunu əks etdirir, məna zənginliyi və üslubi rəngarəngliyi ilə fərqlənir. İngilis frazeoloji ifadələrinin tərcüməsində olan çətinliyin bir səbəbi də ondadır ki, heç bir lüğət frazeoloji vahidlərin konkret kontekstdəki mənasını dəqiqliklə əhatə edə bilmir. Ona görə də tərcümə prosesində frazeoloji vahidlərin ekvivalentlik xüsusiyyəti, bir qayda olaraq, ön plana çəkilir.

İngilis dilində frazeoloji birləşmələrin Azərbaycan dilinə düzgün tərcüməsinə nail olmaq üçün bu dilin incəliklərini bilmək, ingilis xalqının məişətinə, həyat tərzinə yaxından bələd olmaq lazımdır, çünki tərcüməsi çətinlik törədən ifadələr daha çox məişətlə bağlı olur. Məsələn, *And with a great effort he tottered in through a **long window** and sank into old Jolyon's chair*" (J.Galsworthy) cümləsindəki *long window* ifadəsi Azərbaycan dilinə "uzun pəncərə" kimi deyil, "aynalı qapı" kimi tərcümə olunmalıdır. Cümləni isə bütövlükdə belə tərcümə etmək olar: "O, səndələyə-səndələyə **aynalı qapıdan** güclə içəri keçib qoca Coulyonun kürsüsündə əyləşdi" (C.Qolsuorsi).

Bir sıra əsl ingilis frazeoloji ifadələrini Azərbaycan dilinə sinonim sözlərin köməyi ilə tərcümə etmək olar: Müq. et: *to hreak the ice* - "sükutu pozmaq", "ilk addım atmaq", "tanışlıq üçün təməl qoymaq", "aradan pərdəni götürmək"; *On the instant he was thinking how natural and unaffected her manner was now that **the ice between them had been broken**.*" (Th.Dreiser) "Klayd indi **onların arasındakı pərdə götürüləndən sonra** Robertanın özünü necə aparacağı haqqında fikirləşirdi" (T.Drayzer).

Müşahidələr göstərir ki, ingilis və Azərbaycan dilləri fərqli sistemlərə malik olduqları üçun onlarda bir-birinə tam ekvivalent olan frazeoloji birləşmələr də çox deyildir. Ona görə də Azərbaycan dilində ekvivalenti olmayan ingilis frazeoloji birləşmələri mənaca uyğun gələn söz və ya birləşmələrdən istifadə edilməklə tərcümə olunur. Müq. et: *to set the Thames orı fire* "qeyri-adi bir şey etmək", *to be born with a silver spoon in one 's mouth* -"xoş bir saatda dünyaya gəlmək".

Frazeoloji ifadələrin tərcüməsinin mürəkkəbliyi, yuxarıda qeyd edildiyi kimi, bir də onunla bağlıdır ki, bu və ya digər dayanıqlı söz birləşməsinin leksik mənası heç də həmişə onu təşkil edən komponentlərin semantikasından irəli gəlmir. Bıı zəmində tədqiqatçılar və tərcüməçilər arasında fıkir ayrılıqları mövcuddur. Onların bir qismi söz birləşmələrini təşkil edən komponentlərin kalka yolu ilə tərcüməsindən imtina edir, digərləri isə, əksinə, bu cür tərcüməyə meyil edirlər.

Tərcümə zamanı obyekt dildə mənbə dildəkinə oxşar frazeoloji ifadələrin seçilməsinin zəruriliyi barədə fikrin xeyli tərəfdarları vardır. Bu problemin həllinin mürəkkəbliyi nəinki germanistika, türkologiya və rus dilçiliyi qarşısında dayanır, o eləcə də ümumdil xarakteri daşıyır. Beləliklə, ingilis frazeoloji ifadələrini Azərbaycan dilinə tərcümə edərkən adekvatlıq problemi daha qabarıq görünür. Məsələn, *The pot calls the kettle is black* ingilis atalar sözünə Azərbaycan dilində "Kor kora kor deməsə, bağrı çatlar" atalar sözü, yaxud ingilis *There is a life in the old dog yet* ifadəsinə Azərbaycan dilində "Hələ canında su var" uyğun gəlir.

Bizə belə gəlir ki, bu nümunələrin tərcüməsində frazeoloji konstruksiyaların ifadəliliyi, emosionallığı, semantik yükü qorunub saxlanmışdır. Onları adekvat tərcümənin ideal nümunələri hesab etmək olar. Hər iki nümunənin tərcüməsində mənbə dilin daşıyıcılarının spesifık milli xüsusiyyətləri ilə bağlı leksik vahidlər kifayət qədər düzgün tapılmışdır.

Frazeoloji vahidlərin situativ-assosiativ istifadə dairəsi yetərincə genişdir. Orijinal ilə tərcümə olunan material arasındakı eyniliyin (oxşarlığın) qorunub saxlanması kalka yolu ilə edilmiş tərcümə sayəsində mümkün olur. Bununla yanaşı, bu məqsədlə bəzən hərfı tərcüməyə də müraciət edilir. Lakin bir sıra müəlliflər hərfı tərcüməni məqsədəuyğun hesab etmirlər.

İngilis frazeoloji ifadələrinin Azərbaycan dilində mövcud olan ekvivalentlərinin və ya analoqlarının tapılaraq tərcümə edilməsini frazeoloji üsul adlandırmaq olar. Məhz frazeoloji üsul nəticəsində tərcümənin adekvatlığına nail olmaq mümkündür. Müq. et: *Achilles' heel* - *Axilles dahanı, Augean stahle(s)* - *Avgi tövlələri.*

*A drop in the hucket dəryada bir damla, a fly in the ointment* - *milçək bir şey deyil, amma ürək bulandırır, it's raining cats and dogs* - *elə yağış yağır, tut ucundan qalx göyə* birləşmələri analoji tərcümə nümunələri sayıla bilər. Lakin bir çox hallarda obyekt dilin daxili ehtiyatları tam frazeoloji tərcümə üçün material verirlir. Belə hallarda tərcümədə kalka yolu ilə tərcüməyə müraciət olunur. İngilis frazeoloji ifadələrinin Azərbaycan dilinə kalka üsulu ilə çevrilməsinə sonuncuda onlara uyğun gələ bilən frazeoloji ifadələrin olmadığı hallarda müraciət edilir. Bu, frazeoloji vahidlərin transformasiyası üsullarından biridir. Frazeoloji vahidlərin kalka edilməsində mənbə dilin frazeoloji birləşmələrini təşkil edən komponentlərə görə müəyyən edilir. Məsələn, *The moon is not seen when the sun shines* frazeoloji ifadəsinin Azərbaycan dilinə kalka üsulu ilə tərcüməsində ("Gün çıxanda ay görünməz") mənbə dildəki ekpressivlik tam həcmdə saxlanmışdır.

İngilis frazeoloji ifadələrinin Azərbaycan dilinə tərcüməsi üsulları sonuncuda "hazır" modellərlə bağlıdır. Kalka və yarımkalka üsulu ilə tərcüməyə əsasən mənbə dildə və obyekt dildə frazeoloji ifadələrın mənaca üst-üstə düşdüyü hallarda müraciət edilir. Məsələn, əminliklə demək olar ki, ingilis dilinin bilavasitə rolu sayəsində Azərbaycan dilinin aşağıdakı frazeoloji ifadələrlə zənginləşməsi mənbəyi məhz ingilis dilidir: *Kassandra xəbərdarlıqları (Cassandra warnings), qızıl əsr (the golden age), Sezarın arvadı şübhədən kənar olmalıdır (Ceasar's wife must (or should) be above suspicion* - (hərfən "Sezarın arvadı" kimi tərcümə edilə bilən *Ceasar's wife* ifadəsi "şübhədən xali adam" mənasında işlədilir), *Herkules əməyi (a labour of Hercules (the labour of Hercules).*

Tərcümənin onun əsas prinsip və metodlarından (üsullarından) düzgün istifadə olunması səviyyəsində araşdırılması həm nəzəri baxımdan, həm də təcrübi cəhətdən əhəmiyyət kəsb edir. Tərcümə bir dildə digər dilin frazeoloji ifadələrinin açılması və verilməsinin əsas vasitəsidir. Tərcümə zamanı orijinalın məna və məzmununun verilməsində tam dəqiqlikdən başqa, ifadənin emosional və üslubi xüsusiyyətlərinin nəzərə alınması da vacibdir, çünki dillərin frazeologiyası müxtəlif yollarla, fərqli tarixi şəraitlərdə formalaşır, inkişaf edir. Bəzən bir dilin frazeoloji vahidlərinə xas olan emosional və üslubi xüsusiyyətlər digər dildə mövcud olmur. Belə hallarda tərcüməçi bu və ya digər dilin söz və ifadələrinin milli xiisusiyyətləri ilə hesablaşmalıdır.

## Nəticə

Müşahidələr göstərir ki, bəzi frazeoloji ifadələrə araşdırdığımız dillərdən yalnız birində təsadüf edilir. Digər dildə onu analoji vasitələrə vermək mümkün olmur. Məsələn: ing. *Carry coals to Newcastle* ("Nyukasla kömür daşımaq"), azərb. *Naxçıvana duz aparmaq, nöyütü Bakıya daşımaq,* rus. *Ехать в Тулу со своим самоваром* ("Tulaya öz samovarı ilə gəlmək"). Bu tipli ifadələrin yaranması bu və ya digər xalqın həyat tərzi, mədəniyyəti, iqtisadiyyatı, tarixi ilə bağlıdır. Yüksək milli koloritə malik əlatı belə ifadələrin tərcüməsi çox çətindir və artıq qeyd olunduğu kimi, mənbə dilin analoji vasitələri ilə mümkün olmur, ona görə də tərcümə zamanı onların obyekt dilin daşıyıcılarının təfəkkür tərzinə uyğun qarşılığını tapmaq lazım gəlir.

## Ədəbiyyat

1. Əliyeva S. İngilis və Azərbaycan dillərində frazeoloji birləşmələrin leksik-semantik xüsusiyyətləi // Tədqiqlər. AMBA Nəsimi ad. Dilçilik İnstitutu, № 1, 1999, s.100-104.
2. Комиссаров В.l 1. Теория перевода. М., 1990, 253 с.
3. Murtuzayev S. M.F.Axundovun komediyalarının dil və üslub xüsusiyyətləri. Bakı, 1962, s.62-105.

## Contrastive analysis of phraseological units of the English and Azerbaijani languages

**Summary**

Phraseological expressions occupy a special place in the dictionary of each language. There are a number of aspects that must be considered when comparing them. It should be noted that although phraseological expressions have different structures and semantics in languages with different systems, some of them have some similarities.

Observations show that some phraseological expressions are found only in one of the languages that we study. You can not convey it by means of other languages. The appearance of such expressions is associated with the lifestyle, culture, economy and history of a particular nation.

**Контрастивный анализ фразеологических единиц английского и азербайджанского языков**

**Резюме**

Фразеологические выражения занимают особое место в словаре каждого языка. Есть ряд аспектов, которые необходимо учитывать при их сравнении. Следует отметить, что хотя фразеологические выражения имеют разные структуры и семантику в языках с разными системами, некоторые из них имеют некоторые сходства.

Наблюдения показывают, что некоторые фразеологические выражения встречаются только на одном из языков, которые мы изучаем. Нельзя передать его средствами других языков. Появление таких выражений связано с образом жизни, культурой, экономикой и историей той или иной нации.

**Rəyçi: dos. D.Hümbətova**

Göndərilib: 02.06.2020 Qəbul edilib: 04.06.2020

DOI: 10.36719/AEM/2007-2020/55/71-75

**Güldən Dönməz qızı Nəsirova**
Bakı Slavyan Universiteti
gulu.nasirova@inbox.ru

# "KİTABİ – DƏDƏ QORQUD" DASTANINDA FEİL

***Açar sözlər:*** *feil, feili sifət, feili bağlama, sadə feillər, düzəltmə feillər, mürəkkəb feillər, feilin şəkilləri*
***Key words****: a verb, a participle, a verbal adverb, the simple verbs, derivative verbs, difficult verbs, verb inclinations*
***Ключевые слова:*** *глагол, причастие, деепричастие, простые глаголы, производные глаголы, сложные глаголы, наклонения глагола*

## Giriş

Feillər həm leksik tərkibinin, həm də qrammatik kateqoriyalarının zənginliyinə görə başqa nitq hissələrindən fərqlənir. Azərbaycan dili hər zaman başqa dillərin təsirinə məruz qalsa da yad ünsürlər feillərə öz təsirini göstərə bilməmişdir.

Hətta klassik ədəbi dilimizdə də feillərin milli xüsusiyyətlərinə yad təsirlərinə rast gəlmirik.

Müasir Azərbaycan dilində olduğu kimi Azərbaycan dilinin ilk formalaşma dövründə də feil morfoloji cəhətdən rəngarəngliyinə görə digər nitq hissələrindən fərqlənmişdir.

Azərbaycan dilinin feilləri ona məxsus olan aşağıdakı əlamət və xüsusiyyətlərlə başqa nitq hissələrindən seçilir.

1. Feillərin iş görəni, iş icra edəni olur.
2. Feillərdə inkarlıq kateqoriyası vardır.
3. Feillərdə təsirlik və təsirsizlik kateqoriyası vardır.
4. Feillərdə növ kateqoriyası vardır.
5. Feillərdə zaman kateqoriyası vardır.
6. Feillərdə şəxs və kəmiyyət kateqoriyaları vardır.(bu kateqoriyalar isimlərdə də özünü göstərir).
7. Feillərdə xüsusi və ümumi şəkil vardır.
8. Feillərin törəmələri (feili isim - məsdər, feil sifət və feili bağlama) vardır. (6, 118).

H.Mirzəzadə yazır: "Feillər Azərbaycan dilinin milli orijinallığını, əslliyini mühafizə edən yad dillərin təsirinə müqavimət göstərən əsas nitq hissələrindən biri kimi diqqəti cəlb edir".

Dilimizin qrammatik quruluşunun tarixi inkişafını öyrəndiyimiz zaman məlum olur ki, feilin əsas xüsusiyyətləri bütün dövrlər ərzində mühafizə edilib qalmışdır.

Lakin bununla yanaşı zaman keçdikcə feillərin tərkibi kəmiyyətcə artmış və zənginləşmişdir. Bu zaman morfoloji cəhətdən də müəyyən dəyişikliklər olmuş, bəzi formal əlamətlər dəqiqləşmiş, bəziləri dəyişmiş və bəziləri də köhnəliyindən sıradan çıxmışdır. (4, 125-126)

"Kitabi – Dədə Qorqud" dastanında işlənmiş feillər hər cəhətdən müasir Azərbaycan dili ilə bağlıdır.

"Hər şeydən əvvəl qeyd etmək lazımdır ki, "kitab"da feillər böyük işlənmə tezliyi ilə diqqəti cəlb edir: bu, abidənin intonasiyası və başlıcası, bədii məzmunundan, irəli gəlir – güclü dinamizm, hərəkət intensivliyi "Kitabi – Dədə Qorqud"un əsas keyfiyyətlərindəndir". (7, 129).

Ümumiyyətlə, "feil başqa nitq hissələrinə nisbətən həm kəmiyyətcə zəngin, həm də məna və məzmun etibarilə çoxcəhətlidir. Bu kateqoriyanın əsas bir xüsusiyyəti də odur ki, o, bir sıra qrammatik mənaları öz daxilində toplu halda saxlayır. Yəni hər bir sadə feilin daxilində zaman, növ, forma, şəxs, kəmiyyət, tərz anlayışları kompleks şəkilində öz ifadəsini tapır".

**Feilin təsriflənməyən formaları.** Təsriflənən formalardan fərqli olaraq, feilin təsriflənməyən formaları konkret zaman bildirmir, şəxsə və kəmiyyətə görə dəyişmir. Feili isim (məsdər), feili sifət və feili bağlama feilin təsriflənməyən formaları sayılır. Bunlar başqa nitq hissələrinə doğru meyllənən kateqoriyalar kimi meydana çıxmışdır. Belə ki, müəyyən cəhətlərinə görə məsdər ismə, feili sifət sifətə, feili bağlama isə zərfə uyğun gəlir. Məsələn: məsdər isimlər kimi hallanır, mənsubiyyətə görə dəyişir, hətta bəzən cəmlənir, sintaktik vəzifə baxımından da ismin cümlədə daşıya bildiyi vəzifələri yerinə yetirir.

Feili sifət sifətlər kimi aid olduğu sözün əvvəlində gəlib onu izah edir, necə? nə cür? hansı? suallarından birinə cavab verir. Və cümlədə çox vaxt təyin olur.

Feili bağlama da zərflər kimi bir qayda olaraq feilə aid olur və cümlədə zərflik mövqeyində durur. (6, 178)

Bütün sadalanan oxşarlıqlara baxmayaraq feilin təsriflənməyən formaları ən mühüm feil əlamətlərini özündə saxlayır.

“Kitabi – Dədə Qorqud”un dilində feilin təsriflənməyən formaları intensiv işlənir və abidənin poetik məzmunundakı ümumi hərəkəliyi qüvvətləndirir.

**Feili sifətlər**: Sifətləndirmə qabiliyyəti kəsb etmiş feillər Azərbaycan dilinin qrammatik quruluşu sistemində olduqca qədimdir. Feili sifətlərin əmələ gəlməsində iştirak edən şəkilçilər də tarixən olduqca məhsuldar şəkilçilər olmuşlar. (4, 167).

“Kitabi – Dədə Qorqud” dastanında – ar –ər, – maz, – məz şəkilçili feili sifətlərə rast gəlinir. Belə feili sifətlər əşya ilə bağlı daimi əlamət bildirir. Nümunələrə baxaq.

Görər gözüm aydını oğul
Tutar belim qüvvəti oğul (3, 38)

**Feili bağlama**. Yazılı abidənin dilini tədqiq edərkən məlum olur ki, dildə mövcud olan feili bağlamalar məna və vəzifə cəhətdən elə ciddi bir dəyişikliyə uğramamışdır.

“Kitabi – Dədə Qorqud” dastanında aşağıdakı feili bağlamalar işlənmişdir.

1) *– üb – ub*
2) *– uban – übən*
3) *– ubanı – übəni*
4) *- madın / – mədin*
5) *– anda – əndə*
6) *- dugumda – dügündə / – dügümdə – dügündə*
7) *- dıqda – dikdə*
8) *- araq (– ərək)*
9) *- ınca – incə, – yunca – yüncə*
10) *- kəc – cək – caq – icək*

***-ibən, – uban, – übən*** feili bağlama şəkilçisi Azərbaycan dilində XIX əsrin əvvəllərinə kimi geniş miqyasda işlənmişdir. Bu şəkilçinin ifadə etdiyi məna – *ib* şəkilçisinin ifadə etdiyi mənaya uyğun gəlir.

Nümunələrə baxaq:

Göz açuban gördüyüm
Könül verib sevdiyim (3, 30)
Dədəm Qorqud gəlibən boy boyladı (yenə orada)

*– ubanı, – übəni* şəkilçisi

**Qalqubanu** xan Bayandır yerində durmuş, bir yerə ağ otaq, bir yerə qızıl otaq, bir yerə qara otaq dikdirmiş (3, 25)

Bən varıcaq **gəlübəni** qarşuladılar (3, 25)

*– ibəni, – ubanı, – übəni* feili bağlama şəkilçisi “Kitabi – Dədə Qorqud” abidəsinin dili üçün çox əlamətdardır.

H.Mirzəzadə – *ubanı, – übəni* şəkilçisinin yalnız “Kitabi – Dədə Qorqud”un dilində işləndiyini, bu şəkilçinin sonrakı əsrlərin yazı dilinə təsir göstərmədiyini, hətta danışıq dilində çox zəif inkişaf etdiyini qeyd edir. (5, 286)

E.Əzizov yazır: “Özlüyündə dəqiq olmayan bu fikir eyni zamanda bizə imkan verir ki, – *ubanı, – übəni* şəkilçisini ədəbi dil materiallarında dialekt xüsusiyyəti sayaq, çünki Azərbaycan dili tarixinin görkəmli mütəxəssisinin qeydlərindən – ubanı – übəni şəkilçisinin ədəbi dil üçün norma olmadığı aydınlaşır. “Kitabi – Dədə Qorqud”un dilində bu şəkilçinin geniş şəkildə işlənməsi, görünür ki, abidənin yarandığı dövrün canlı şivələri ilə bağlıdır”. (2, 199)

Müəllif *– ıbənı, – ubanı, – übəni* formasını oğuz elementi sayır.

*– anda – əndə* şəkilçisi ilə bağlı nümunələrə baxaq:

**Çalışanda** qara polat uz qılıncın gödəlməsin (3, 36)
Ağ – ban evim **dikiləndə** yurdı qalmış,
Qarıcıq anam **oturanda** yeri qalmış
Oğlum Uruz ox **atanda** buta qalmış,
Oğuz bəgləri at **çapanda** meydan qalmış
Qara mudbaq **dikiləndə** ocaq qalmış (3, 40)
Qaranqu axşam **olanda** güni doğan,
Qar ilə yağmur **yağanda** ər kibi duran (3, 41)

*– anda, – əndə* feili bağlama şəkilçisi 2 tərkib hissədən *an, – ən* (feli sifət), *–da, –də* (ismin yerlik hal) şəkilçilərindən ibarətdir.

Bu şəkilçi feil köklərinə artırılaraq əsas feilin zaman zərfi məqamında işlənir.

*– dügündə,– digində,– duğumda,– duğunda* şəkilçisi

Qarı ölüm **gəldigində** keçit versün (3, 36)

-ınca,– incə, – yunca, – yüncə şəkilçisi ilə bağlı nümunələrə baxaq:

Allah – Allah **diməyincə** işlər olmaz

Qadir Tanrı **verməyincə** ər bayımaz

əcəl vədə **irməyincə** kimsə ölməz (3, 19)

-*araq (– ərək)* şəkilçisi

qanlı qoca **gedərək** gəldi, oğuza çıqdı (3, 105)

*– kəc – cək /– caq – icək* şəkilçisi

Çoban böylə **digəc** Qazan ah etdi, ağlı başından getdi,

Dünya – aləm gözinə qarannu oldu (3, 47)

*–alı, – əli* şəkilçisi bu feili bağlama şəkilçisi hal-hazırda Azərbaycan dilində qərb şivələrində saxlanılır.

Müasir Azərbaycan dilində zəifləmiş həmin şəkilçi XIX əsrə qədər bədii üslub nümunələrinin dilində işlənmişdir.

Beyrək **gedəli** Bam – bam dəpə başına çıqdınmı, qız

Qarılatıb dört yanına baqdınmı, qız?! (3, səh.74)

Və ya

Mən bu yerdən **gedəli** dəlü olmışsan

Dəlim ağca qarlar yağmış, dizə yetmiş (3, 74)

Məsdərə aid nümunələr

Babası aydır: "oğul, ya səni evərmaxmı gərək?" "Bəli, bəs ağ saqalu əziz baba, **evərmax** gərək!" (3, 57)

Mən qarağuc atıma binmədin ol **binmax** gərək.

Mən qırıma varmadın ol mana baş **gətürmək** gərək. (yenə orada)

**Feilin quruluşca növləri.** Feillər quruluşuna görə sadə, düzəltmə və mürəkkəb feillərə ayrılır. Bütün feillərə diqqət yetirsək, görərik ki, onların bir qismi yalnız feil köklərindən, bir qismi feil və ya başqa nitq hissələri ilə sözdüzəldici şəkilçilərdən, digər qismi də bir feillə başqa bir nitq hissəsinin, yaxud köməkçi feilin iştirakından əmələ gəlib.

**Sadə feillər:** Sadə feillər heç bir sözdüzəldici şəkilçinin köməyi olmadan ifadə edilir, bütün zamanlar və bütün şəxslər üzrə təsdiq və inkarda olur.

Nümunələrə baxaq:

Səksən yerdə badyalar qurılmışdı

"Ünüm anlan bəglər, sözüm dinlən bəglər, yürüləyim a bəglər" (3, 37)

Əcəl aldı, yer gizlədi, fani dünya kimə qaldl (3, 36)

**Düzəltmə feillər:** Dilimizdə olan düzəltmə feillər isim, sifət, say, əvəzlik, zərf və yamsılamalardan, feil köklərindən də əmələ gəlir. (–la, –lə, –lan, –lən, –laş, –ləş –(ilda) və s.

Nümunələrə baxaq:

Qazan su ilə xəbərləşdi (3, 41)

Arğab – arğab qara dağın yıxılmışdı, yucaldı, axır

Kafirin casusu casusladı (3, 41)

**Mürəkkəb feillər.** Öz zənginliyinə və oynadığı roluna görə müasir ədəbi dilimizdə işlənən mürəkkəb feillər böyük əhəmiyyətə malikdir.

Müasir dilimizdə olduğu kimi, qədimdə, o cümlədən "Kitabi – Dədə Qorqud "un dilində mürəkkəb feillərin tərəfləri defislə və ayrı yazılmışdır.

Mürəkkəb feillər müxtəlif struktur-semantik xüsusiyyətlərə malikdir. Mürəkkəb feillər yaxın və əks mənalı sözlərin birləşməsindən, eyni feilin təkrarından ibarət olub defislə yazılır.

Məsələn:

Beyrək odasında igidlərlə yeyib - içirdi (3, 124)

Və ya

Bu oğuznaməyi düzdi – qoşdı (3, 50)

Mürəkkəb feillərin bir qismi əks mənalı sözlərin birləşməsindən yaranır.

Məsələn:

Oğlan keyigi qovarkən babasının ögindən gəlib - gedərdi. (3, 37)

Və ya

Baqsa görsə bir dərənin içinə qara-quzğun enər – çıqar, qonar-qalqar (3, 38).

Müstəqil mənalı feillər isimlərdən sonra işlənməklə mürəkkəb feil əmələ gətirir. Belə mürəkkəb feillərin hər 2 komponenti (ad və feil hissəsi) eyni kökə malik olur.

Nümunələrə baxaq:

Dədəm Qorqud boy boyladı, soy soyladı (3, 36)
Yürügəlim, a bəglər, av avlayalım, quş quşlayalım (3, 37)

**Feilin şəkilləri.** Bəzi istisna halları nəzərə almasaq, deyə bilərik ki, müasir dilimizdə işlənən feil şəkillərini düzəldən şəkilçilərin çoxu əsasən “Kitabi – Dədə Qorqud” dastanları dilində də işlənmişdir. “Kitabi – Dədə Qorqud” dastanları dilində əmr şəklinin bir sıra maraqlı xüsusiyyətləri vardır.

Məsələn:
Bəri gəlgil, başum baxtı, evim taxtı (3, 25)
Çağırıb xatununa soylar, görəlim, nə soylar (3, 25)
“Ana ağlamağıl, mana bu yaradan ölüm yoqdur, qorxmagil!”
“Gəlin, Dirsə xanı tutalım, ağ əllərin ardına bağlayalım
qıl sicim ağ boynuna taqalım, aluboni kafir ellərinə yönələlim” (3)
Nümunələrdən də göründüyü kimi “Kitabi – Dədə Qorqud” dastanında
I şəxs təki üçün *–ayın, – əyin,– ayım, – əyim*
I şəxs cəmi üçün *–alım, – əlim, – əvuz,– avuz*
II şəxs təki üçün *–qıl, – ğil, – gil*
II şəxs cəmi üçün *–ın, – in,– un, – ün, – uz, –üz*
III şəxs təki üçün *–sın, – sin, –sun, – sün*
III şəxs cəmi üçün – *sun(lar), –sün(lər)* şəkilçiləri xarakterikdir.

Vacib şəkli “Kitabi – Dədə Qorqud” dastanlarında müasir Azərbaycan dilindəki vacib şəklinin əlaməti olan “– malı / –məli” şəkilçisi işlənməmişdir: Bunun əvəzinə müəyyən şəkillərə düşmüş feillərdən sonra “gərək” sözü yazılmışdır.

Mən qarağuc atıma binmədin, ol binmax gərək!
Və yaxud
Mən qırıma varmadın ol mana baş gətirmək gərək (3, 57).
Nümunələrdən də göründüyü kimi “gərək” sözü ən çox məsdərlərdən sonra gəlir.

Şərt şəkli Müasir Azərbaycan dilində olduğu kimi “Kitabi – Dədə Qorqud”un dilində də feilin şərt şəkli – *sa, – sə* – şəkilçiləri ilə ya da “isə” qoşması ilə ifadə edilmişdir.

Nümunələrə baxaq:

“Hər kim ol üç canvəri bassa – yensə, öldürsə, qızımı ona verirəm” deyə vədə eyləmişdi. Basmasa, başın kəsərdi (3, 104)

Arzu şəkli Müasir Azərbaycan dilində olduğu rimi “Kitabi – Dədə Qorqud”un dilində də işin, hərəkətin keçmiş və ya gələcəkdə icra edilməsinin arzu olduğunu ifadə etmək üçün feillərə *– a, – ə, – ya, – yə* şəkilçiləri artırılır. Məsələn:

“Baba, mən yerimdən durmadın ol durmuş ola (3, 104)
Və ya
Qalqubam yerimdən duraydım (3, 114)
“Xanım məqsudum olur ki, ərə varan qız qalqa, oynaya, mən qopuz çalam” (3, 72)
Bacarıq şəkli

“Kitabi – Dədə Qorqud” dastanlarının dilində bacarıq şəklinin ancaq inkar növü, yəni bacarmamaq növü işlənmişdir.

Müasir Azərbaycan ədəbi dilində olduğu kimi feilə *“a/ə”* şəkilçilərindən biri bitişdirilir və “bil” feilinin əvvəlinə qoşulur. (1, 108)

Yığar – dərər, tələb eylər, nəsibindən artuğun yiyə bilməz (3, 19 )
Səndən yeyrək Qadir bizə oğul verməz
Versə dəxü sənin yerin tuta bilməz (3, 91)

Göründüyü kimi feillər mətndə digər leksik qrammatik söz qrupları – nitq hissələri ilə müqayisədə böyük kəmiyyət üstünlüyünə malikdir və qeyd etmək lazımdır ki, dastanın istənilən boyunu nəzərdən keçirdikdə bu üstünlüyün şahidi oluruq.

**Ədəbiyyat**

1. Ə.Dəmirçizadə. “Kitabi – Dədə Qorqud” dastanlarının dili. Bakı, 1959
2. E.Əzizov. Azərbaycan dilinin tarixi dialektologiyası. Bakı, 2016
3. “Kitabi – Dədə Qorqud” dastanı.
4. H.Mirzəzadə Azərbaycan dilinin tarixi qrammatikası, Bakı, 1990
5. H.Mirzəzadə Azərbaycan dilinin tarixi morfologiyası. Bakı: “Azərtədris” nəşr., 1962.
6. Müasir Azərbaycan dili. Morfologiya III hissə, Bakı: “Şərq-Qərb”, 2007

7. N.Xudiyev. Azərbaycan ədəbi dilinin təşəkkülü. Bakı, 1991.

**Verb in the epos "Kitabi-Dede Gorgud"**
**Summary**

The article deals with the verbs used in the epos "Kitabi-Dede Gorgud". Verbs differ from other parts of speech both on lexical structure, and on riches of a grammatical category. As a part of any simple verb find the complex expression of a category of time, a kind, an inclination, the person, number, pledge. In "Kitabi-Dede Gorgud" verbs possess high rate of the use. In article on the basis of the examples chosen from the epos kinds of verbs on a structure (simple, derivative, difficult), indeclinable forms of a verb (a participle, a verbal adverb, an infinitive), an inclination (imperative, necessary, conditional, desirable, ability) are investigated.

Here it is noticed, that despite some exceptions, verbs of modern Azerbaijani language not so strongly differ from verbs in "Kitabi-Dede Gorgud".

Though the Azerbaijani language also tested strong influence of other languages at all times, nevertheless on verbs it has not rendered any influence.

**Глагол в эпосе «Китаби-Деде Горгуд»**
**Резюме**

В статье говорится о глаголах, использованных в эпосе «Китаби-Деде Горгуд». Глаголы отличаются от других частей речи как по лексическому составу, так и по богатству грамматической категории.

В составе любого простого глагола находят свое комплексное выражение категории времени, вида, наклонения, лица, числа, залога. В «Китаби-Деде Горгуд» глаголы обладают высокой частотностью употребления.

В статье на основании выбранных из эпоса примеров исследуются виды глаголов по строению (простые, производные, сложные), несклоняемые формы глагола (причастие, деепричастие, инфинитив), наклонение (повелительное, долженствовательное, условное, желательное, способное). Здесь отмечается, что несмотря на некоторые исключения, глаголы современного азербайджанского языка не так сильно отличаются от глаголов в «Китаби-Деде Горгуд».

Хотя азербайджанский язык во все времена и испытывал сильное влияние других языков, все же на глаголах это влияние не оказало какого-либо воздействия.

**Rəyçi: dos.D.Hümbətova**

Göndərilib: 05.06.2020 Qəbul edilib: 06.06.2020

## HÜQUQ THE LAW ПРАВО

DOI: 10.36719/AEM/2007-2020/55/76-79

**Rauf Əhəd oğlu Şəmsizadə**
Bakı Dövlət Universiteti

# TƏKRAR CİNAYƏTLƏRİN TÖVSİFİ MƏSƏLƏLƏRİ

***Açar sözlər:*** *cinayətlərin çoxluğu, cinayətlərin təkrarlığı, cinayətlərin tövsifi, təkrar cinayətlərin tövsifi*
***Keywords:*** *multiplicity of crimes, repetition of crimes, qualification of crimes, qualification of repeated offences.*
***Ключевые слова:*** *множественность преступлений, повторность преступлений, квалификация преступлений, квалификация повторных преступлений*

Yaranan ictimai münasibətləri tənzimləməyə, ölkənin konstitusiya quruluşunu mühafizə etməyə və möhkəmləndirməyə xidmət edən Azərbaycan cinayət qanunvericiliyi insanın, vətəndaşın hüquq və azadlıqlarının müdafiə edilməsinin təmin olunmasında mühüm hüquqi rol oynayır. İctimai münasibətlərin mühafizəsi və möhkəmləndirilməsi müxtəlif yollar və metodlarla gerçəkləşdirilir. Müəyyən qanunvericilik göstərişləri öz davranışını qüvvədə olan qanunların tələblərinə uyğun quran vəzifəli şəxslərin və ayrı-ayrı vətəndaşların hərəkətlərinə ciddi tənzimləyici təsir göstərir. Digər tərəfdən ictimai münasibətlərin iştirakçıları arasında mübahisə və ya münaqişələrin yarandığı zaman dövlətin məcburiyyət tədbirinin tətbiqi zərurəti yaranır. Qanun normasının tətbiqinin reallığı dövlətin məcburiyyət tədbirinin qüvvəsi ilə təmin olunur.

Azərbaycan Respublikası cinayət qanunvericilik normalarının tətbiqi mürəkkəb və çox şaxəli prosesdir. Bu, cinayət hüquq normalarının müxtəlif xarakterli olması ilə bağlıdır. Belə ki, məsələn, Cinayət Məcəlləsinin (CM) Ümumi hissəsinin normalarının tətbiqi Məcəllənin Xüsusi hissəsinin normalarının tətbiqi ilə müqayisədə öz spesifikliyinə malikdir. Müraciət edilən bu tədqiqat cinayət hüquq normalarının tətbiqində əsas mərhələlərindən birinə – təkrar törədilən cinayətlərin tövsifi məsələlərinə həsr edilmişdir.

Hüquq ədəbiyyatında deyildiyi kimi, cinayətlərin tövsifi anlayışı nəzəriyyə və praktikada iki mənada işlədilir: a) tövsif müəyyən məntiqi proses, bu və ya digər şəxsin nəzərdən keçirdiyi konkret hadisənin Cinayət Məcəlləsinin normasında göstərilən cinayət tərkibinin əlamətlərinə uyğunluğunu (eyniliyini) müəyyənləşdirmək üzrə fəaliyyəti kimi; b) tövsif ictimai təhlükəli əməlin müəyyən hüquqi qiymətləndirilməsi kimi (5, 7). Cinayətlərin tövsifinin yuxarıda qeyd edilən mənası anlayışı bir-biri ilə sıx bağlıdır. V.N.Kudryavtsev haqlı olaraq yazır ki, «bu aspektlərin əlaqəsini və birliyini qeyd etmək onların arasındakı fərqləri göstərməkdən daha vacibdir. Ona görə də tövsif anlayışının tərifində onun hər iki mənasının yerləşdirilməsi və cinayətin tövsifini törədilmiş əməlin əlamətləri ilə cinayət norması ilə nəzərdə tutulan cinayət tərkibinin əlamətləri arasında dəqiq uyğunluğunun və hüquqi təsbitinin müəyyən edilməsinin müəyyənləşdirilməsi məqsədəuyğundur (4, 7-8).

Görkəmli alim F.Y.Səməndərovun fikrincə, «tövsif – bu, ərəb mənşəli «tövsiyə» sözündən olub, necə hərəkət etmək, bir işi necə görmək haqqında təklif, məsləhət, tapşırıq vermək mənasını ifadə edir. Cinayət hüququnda baş vermiş cinayətə görə məsuliyyətin həllində qanunun bu və ya digər normasını seçməyə dair fəaliyyət mənasında işlədilir. Cinayətin tövsifində törədilən cinayətə faktiki hüquqi qiymət verilir» (3, 35-36). Lakin ərəb dilində «tövsif sözün kökünə müraciət edilsə, bu öz tövsiyə sözünə deyil, «vəsf» sözünə uyğun gəlir. Nəzərə alsaq ki, tövsiyə sözünün bir mənası da vəsiyyət sözünə uyğundur, qeydlərimiz yerini tapır. Beləliklə, cinayətin tövsifi dedikdə, konkret törədilmiş əməlin cəhətləri ilə cinayət hüquq normasında nəzərdə tutulan tərkib əlamətləri arasında eyniliyi müəyyən etməklə, müvafiq hüquqi sənəddə öz əksini tapan və cinayət-hüquqi nəticələrə səbəb olan əmələ verilən cinayət-hüquqi qiymət başa düşülür.

Daha konkret ifadə etsək, əməlin tövsifi hüquqşünasın praktiki fəaliyyət növü, fəlsəfi-hüquqi mənada idrak prosesidir. Tövsif, bu sözün həqiqi mənasında qanunla nəzərdə tutulan cinayət tərkibi əlamətlərinin tövsif edilən cinayətlərin əlamətləri ilə müqayisə edilməsindən ibarətdir. Deməli, cinayətin tövsifi həm də qanun normasını tətbiq edən şəxsin intellektual fəaliyyətinin (əqli əməyinin) əlahiddə növündən ibarətdir.

Məlumdur ki, cinayət hüquq münasibətlərinin yaranmasının son məqamı cinayət məsuliyyətidir. Cinayət məsuliyyətinin yeganə əsasına isə törədilmiş ictimai təhlükəli əməldə cinayət tərkibinin əlamətlərinin olması təşkil edir. Deməli, əgər törədilmiş əməldə cinayət hüquq normasında nəzərdə tutulan tərkib əlamətləri mövcud olmasa, cinayət məsuliyyəti də istisna ediləcəkdir. Hüquq ədəbiyyatında deyildiyi kimi, «…əməldə

subyekti olması qənayətindəyik. Müasir beynəlxalq hüququn təbiəti və quruluşundan irəli gələrək mübahisəsiz obyektiv hüquq subyektliyində sahib olan dövlətlər və bəzi beynəlxalq təşkilatlar beynəlxalq hüquqda birbaşa və çox geniş mənada hüquqlara sahib olub bütün digər beynəlxalq hüquq subyektlərinə nisbətən mütləq subyekt olaraq qəbul edilir. Yəni erga omnes bir subyektliyə malikdirlər.

Məhdud bir hüquq subyektliyinə dayanan hüquq və vəzifələr, beynəlxalq hüququn dövlətlər başda olmaq üzrə substantiv şəxslər arasında həyata keçirilən bir beynəlxalq razılaşmadan, beynəlxalq toplumun ehtiyaclarından və ya sahib olunan güc və təsirli nəzarətdən yarana bilər. Dolayısıyla, sahib olunan hüquq və vəzifələr subyektə görə dəyişir. Məsələn, bəzi subyektlər beynəlxalq müqavilə bağlamaq hüququna və ya beynəlxalq məhkəmələrə getmə hüququna sahib olsa da, bəziləri olmaya bilər. Buna görə də müəyyən xüsusi hüquq və vəzifələrə malik olmaqla, beynəlxalq hüquq subyektliyinə malik olub olmaması mübahisəsi arasındakı fərqi bilmək lazımdır. Nəticədə, məhdud beynəlxalq hüquq subyektliyi anlayışının qəbul edilməsi düzgün addım olmuşdur.

## Ədəbiyyat

1. Hüseynov L.H. Beynəlxalq hüquq. Bakı-2012: "Qanun" nəşriyyatı, səh 368.
2. Ed. Andrea Bianchi, Ashgate, Farnham, 2009.
3. Hersch Lauterpacht, International Law Collected Papers: I. General Works, Ed. E.Lauterpact, Cambridge, Cambridge University Press, 2009.
4. Island of Palmas case (Netherlands, USA), Reports of International Arbitral Awards, C: II, 1928. https://l egal.un.org/riaa/cases/vol_II/829-871.pdf
5. Report of the Study Group of the International Law Commission, A/CN.4/L.682, 13 April 2006.
6. The Presbyterian Church Of Sudan, et al. v. Talisman Energy., 453 F. Supp. 2d 633, 2006. http://www.internationalcrimesdatabase.org/Case/43/Presbyterian-Church-Of-Sudan-v-Talisman-Energy/
7. Christian Okeke, Controversial Subjects of Contemporary International Law: An Examination of the New Entities of International Law and their Treaty-Making Capacity, Rotterdam, Rotterdam University Press, 2014.
8. Lauterpacht, "The Subject of International Law".

## Nature and types of international legal subject

**Summary**

International legal entity, the ability of a subject of international law to be a participant in international legal relations, in particular to conclude and execute international agreements. International jurisprudence is included in the existence of corresponding rights and obligations. The right of primary and secondary subjects of international law differs. Thus, for a state, legal personality is universal, they possess it in full volume from the moment of their creation. Nations and peoples who fight for their self-determination, to claim their recognition by the subjects of international law only in compliance with certain conditions.

## Природа и виды международной правосубъектности

**Резюме**

Международная правосубъектность – это способность субъекта международного права быть участником международных правоотношений, в частности заключать и выполнять международные дого воры. Международная правосубъектность заключается в наличии соответствующих прав и обязанносте. Правосубъектность первичных и вторичных субъектов международного права отличается. Так для государств правосубъектность является универсальной, они владеют ей в полном объёме с момента их создания. Нации и народы, которые борются за своё самоопределение, вправе претендовать на признание их субъектами международного права только при соблюдении определенных условий.

**Rəyçi: prof. Ə.Sadıqov**

Göndərilib: 25.06.2020 Qəbul edilib: 28.06.2020

DOI: 10.36719/AEM/2007-2020/55/108-111

**Əzizxan İman oğlu Əzizov**
Bakı Dövlət Universiteti
Ezizov_eziz@hotmail.com

# AZƏRBAYCAN RESPUBLİKASI MİLLİ MƏCLİSİNİN SƏLAHİYYƏTLƏRİNİN KONSTİTUSİON XARAKTERİSTİKASI

***Açar sözlər:*** *Azərbaycan Respublikası, Konstitusiya, qanunvericilik hakimiyyəti, Milli Məclis*
***Key words:*** *Azerbaijan Republic, Constitution, legislative power, Milli Majlis*
***Ключевые слова:*** *Азербайджанская Республика, конституция, законодательная власть, Милли Меджлис*

## Giriş

Parlamentin konstitusion səlahiyyətlərinin həcmindən asılı olaraq onun üç növü vardır. Parlament idarəçilik formasının hökm sürdüyü ölkələrdə parlamentin səlahiyyətləri qeyri-məhduddur. E.Uejd və F.Fillips qeyd edirdilər ki, parlamentin aliliyi qanunvericiliyin aliliyini, dövlət büdcəsini təsdiq etmək və vergiləri təyin etmək hüququnu, hökumətin parlament qarşısında kollektiv məsuliyyətini, hakimləri təyin etmək hüququ, rəqabət aparan başqa oxşar hakimiyyətlərin olmamasını nəzərdə tutur (5, s.70).

Piter Bromhedə görə, qanunvericilik aktlarının məzmunu ilə bağlı heç bir konstitusion məhdudiyyət yoxdur, hər hansı qanunun qəbulu ilə bağlı hər hansı maneə yoxdur (4, s. 199). ABŞ Konstitusiyasının 1-ci maddəsinin 1-ci bəndində qeyd olunur ki, burada bütün qanunvericilik səlahiyyətləri senat və nümayəndələr palatasından ibarət Birləşmiş Ştatlar konqresinə verilmişdir. İtaliya Respublikasının Konstitusiyasının 55-ci maddəsinə görə, parlament millət vəkilləri Palatasından və Respublika senatından ibarətdir. Həmin konstitusiyanın 70-ci maddəsində isə qanunvericilik funksiyasının hər iki palata tərəfindən birgə yerinə yetirilməsindən bəhs olunur. Yaponiyanın 1946-cı il Konstitusiyası 41-ci maddədə nəzərdə tutur ki, parlament ən ali dövlət hakimiyyət orqanıdır və dövlətin yeganə qanunverici orqanıdır. Yaponiya konstitusiyasında parlamentin səlahiyyətləri sadalanmadığından, predmetinə görə onun səlahiyyətlərinin qeyri-məhdud olması nəticəsinə gəlmək olar. Yaponiya Konstitusiyasının 59-64-cü maddələrindən parlamentin qanunvericilik, büdcə, nəzarət və məhkəmə səlahiyyətlərinə malik olmasını müəyyənləşdirmək olar.

Azərbaycan Respublikası Milli Məclisinin öz konstitusion funksiyalarını müvəffəqiyyətlə həyata keçirə bilməsi üçün Azərbaycan Respublikasının Konstitusiyasında zəruri səlahiyyətlər təsbit olunmuşdur.

Milli Məclisin səlahiyyətlərini müxtəlif şəkildə qruplaşdırmaq olar. Milli Məclisin qanunvericilik, maliyyə, beynəlxalq müqavilələrin ratifikasiyası və denonsasiyası, dövlət orqanlarının və təşkilatların formalaşması, vəzifəli şəxslərin təyin edilməsi və ya seçilməsi və bu prosedurlarda iştirak, dövlət orqanlarının, təsisatlarının və vəzifəli şəxslərin fəaliyyətinə nəzarət, müdafiə və təhlükəsizlik sahəsində səlahiyyətlər, məhkəmə səlahiyyətlərini fərqləndirmək olar.

Azərbaycan Respublikasmm Konstitusiyası Milli Məclisin səlahiyyətlərini onun müəyyən etdiyi ümumi qaydalar və həll etdiyi məsələlərdən ibarət olmaqla iki qrupa bölür. Milli Məclisin müəyyən etdiyi ümumi qaydalarla həll etdiyi məsələlər arasında fərqli cəhətlər vardır. Milli Məclis tərəfindən ümumi qayda müəyyən edilməsi onun tərəfindən hüquq norması müəyyən edilməsini nəzərdə tutur. Milli Məclisin müəyyən etdiyi ümumi qaydalar onun qanunvericilik funksiyası ilə bağlıdır. Azərbaycan Respublikasının Konstitusiyasının 94-cü maddəsi Milli Məclisin müəyyən etdiyi ümumi qaydaları təsbit edir. Azərbaycan Respublikasının Konstitusiyasının 95-ci maddəsində isə Milli Məclis tərəfindən həll edilən məsələlərin dairəsi göstərilmişdir. Milli Məclisin həll etdiyi məsələlər qanunvericilik hakimiyyətini təmsil edən orqan kimi onu icra və məhkəmə hakimiyyəti ilə əlaqələndirən və hakimiyyət bölgüsündə iştirak etməyə imkan verən səlahiyyətlərindən təşkil olunmuşdur. Azərbaycan Respublikasının Konstitusiyasının 94-cü maddəsinin III hissəsi və 95-ci maddəsinin IV hissələrində qeyd olunur ki, bu maddənin birinci hissəsinə Konstitusiya qanunu ilə əlavələr edilə bilər. Deməli, buradan belə nəticəyə gəlmək olar ki, Milli Məclisin səlahiyyətləri genişləndirilə bilər. Azərbaycan Respublikasının Konstitusiyası ilə Milli Məclisə verilən səlahiyyətlər onun faktiki fəaliyyət imkanını, habelə parlament tərəfindən dövlət idarəçiliyinin həyata keçirilməsinə təsirini müəyyən edir.

Azərbaycan Respublikasının Konstitusiyasının 94-cü maddəsində Milli Məclisin qanunverici səlahiyyətinin predmetindən söhbət gedir. Bu maddədə təsbit olunanlar üzrə Milli Məclis yalnız norma müəyyən edir. Məhz Azərbaycan Respublikasının Konstitusiyasının 94-cü maddəsində göstərilən sahələr üzrə qanun vermək səlahiyyətini həyata keçirməklə Milli Məclis Azərbaycan Respublikasının dövlət siyasətinin əsaslarını formalaşdırır.

Professor Z.Əsgərov qeyd edir ki, səlahiyyətlərin deleqiyası adətən, qanunverici orqanla icra hakimiyyəti arasında olur. Bir qayda olaraq, qanunvericilik səlahiyyətləri icra hakimiyyəti orqanlarına ötürülür. Bu mexanizmin qurulmasında əsas məqsəd operativlik və informasiyanın peşəkar analizini tələb edən məsələlərlə bağlı baş verən mümkün problemləri aradan qaldırmaq üçün səlahiyyətin daha geniş imkanlı və məsələyə tez reaksiya verə bilən orqana ötürülməsidir. Müəllif davam edərək yazır ki, deleqiya, həmçinin səlahiyətlər sistemində baş verən potensial kolliziyaların qarşısını almaq üçün də istifadə olunan mexanizmdir (3, s. 367).

Dövlət hakimiyyətinin ayrı-ayrı budaqlarına məxsus olan səlahiyyətlərin həcmindən, onların bir-birinə münasibətindən asılı olaraq, hakimiyyət bölgüsünün mövcud olub-olmaması haqqında fikir söyləmək olar. Buna görə də hakimiyyətlərin bölünməsini təhlil edərkən qanunvericilik, icra və məhkəmə hakimiyyətləri üçün səciyyəvi olan səlahiyyətlərə xüsusi diqqət yetirmək zəruridir. Qanunvericilik, icra və məhkəmə hakimiyyətlərinə məhz o səlahiyətləri aid etmək olar ki, onlar həmin hakimiyyət qollarının bir-birinə təsir etməsi və nəzarət etməsini təmin edir. Azərbaycan Respublikasının Milli Məclisinə məxsus olan səlahiyyətlər digər hakimiyyət qoluna yönəlir və onun fəaliyyət sahəsinə təsir etməyə imkan verir. Bu baxımdan da Azərbaycan Respublikasının Milli Məclisinin dövlət hakimiyyəti sistemində tutduğu yeri müəyyənləşdirmək üçün onun formalaşdırılması əsaslarını, habelə təyinatını müəyyən edən normalar nəzərə alınmalıdır. Azərbaycan Respublikasının Milli Məclisinin maliyyə səlahiyyəti dövlətin gəlir və xərclərini təsdiq etmək, vergiləri təyin etmək səlahiyyətləridir. Haqqında bəhs edilən səlahiyyətin qanun formasında həyata keçirilməsinə baxmayaraq, o, Milli Məclisin səlahiyyətlərinin xüsusi bir hissəsini təşkil edir. Dövlət gəlirləri və xərclərinin yazılı qeydiyyatı dövlət büdcəsidir. Dövlət büdcəsində dövlətin bütün maliyyə ehtiyacları və onları ödəmək üçün zəruri olan bütün gəlirlərin smetası göstərilir. Milli Məclis Azərbaycan Respublikasının Konstitusiyasının 95-ci maddəsinin 5-ci hissəsinə görə, dövlət büdcəsini Azərbaycan Respublikasının Prezidentinin təqdimatına əsasən təsdiq edərkən bir tərəfdən hökuməti dövlət vəsaitlərini təsdiq olunmuş smeta üzrə xərcləməyə və bundan kənara çıxmamağa məcbur edir, digər tərəfdən hökumətin üzərinə dövlətin gəlirlərini təmin etmək üçün zəruri olan vergilərin və başqa daxil olmaların cəmini yığmaq vəzifəsi qoyur.

Azərbaycan Respublikası Milli Məclisinin səlahiyyətlərinin ümumi xarakteristikası haqqında danışarkən buraya beynəlxalq müqavilələrin təsdiqi və ləğvini də aid etmək lazımdır. Bu səlahiyyət hüquq ədəbiyyatında beynəlxalq müqavilələrin ratifikasiyası və denonsasiyası da adlanır. Ratifikasiya dövlətin müəyyən olunmuş formada sazişin bağlanmasına verdiyi yekun razılığıdır. Denonsasiya isə dövlətin müəyyən olunmuş formada sazişin pozulmasına yönələn iradəsidir. Ənənəvi olaraq beynəlxalq müqavilələri ratifikasiya və denonsasiya etmək səlahiyyəti dövlət başçısına məxsus olub. Amma zaman keçdikcə beynəlxalq sazişlər dövlətin daxili qaydalarına daha çox müdaxilə etməyə, onu öz daxili qanunvericiliyində bu və ya başqa şəkildə dəyişikliklər etməyə sövq etdi. Beynəlxalq müqavilələrin daxili qanunlarla müqayisədə üstünlüyü prinsipi son dövrlərdə konstitusiyalara da nüfuz etmişdir. Azərbaycan Respublikasının Konstitusiyasında da bu prinsip öz əksini tapmışdır. Azərbaycan Respublikası Konstitusiyasının 148-ci maddəsinin 2-ci hissəsinə görə Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələr Azərbaycan Respublikasının qanunvericilik sisteminin ayrılmaz tərkib hissəsidir, Azərbaycan Respublikasının Konstitusiyasının 151-ci maddəsinə görə isə Azərbaycan Respublikasının qanunvericilik sisteminə daxil olan normativ hüquqi aktlar ilə (Azərbaycan Respublikasının Konstitusiyası və referendumla qəbul edilən aktlar istisna olmaqla) Azərbaycan Respublikasının tərəfdar çıxdığı dövlətlərarası müqavilələr arasında ziddiyyət yaranarsa, həmin beynəlxalq müqavilələr tətbiq edilir (1 s. 58-60).

Beynəlxalq müqavilələr Azərbaycan Respublikası qanunvericilik sistemində üçüncü yerdə durur. Çünki qanunlar arasında ziddiyyət olduqda qanunların iyerarxiyasının yuxarı pilləsində duran aktın göstərişləri tətbiq olunur. Deməli konstitusiya və referendumla qəbul olunan qanunlar istisna olmaqla, digər qanunlarla beynəlxalq müqavilələr arasında ziddiyyət yaranarsa, beynəlxalq müqavilənin norması tətbiq olunduğundan, əslində Azərbaycan Respublikasının qanunvericilik sistemində üçüncü yerdə qanunlar deyil, beynəlxalq müqavilələr durmalıdır (2, s. 541).

Yuxarıda deyilənlərdən belə bir nəticəyə gəlmək olar ki, qanunverici hakimiyyət beynəlxalq müqavilələrin daxili hüquqa toxunan hissəsi də daxil olmaqla bağlanmasında və ləğv edilməsində iştirak etməlidir.

Azərbaycap Respublikasının Konstitusiyasının 94-cü maddəsinin 1-ci hissəsinin 4-cü bəndi də, Azərbaycan Respublikası Milli Məclisinin müəyyən etdiyi ümumi qaydalara referendumu da aid edir ki, bu məsələ üzrə Milli Məclis 83 səs çoxluğu ilə qanunlar qəbul etmək səlahiyyətinə malikdir.

Azərbaycan Respublikasının Konstitusiyasının 94-cü maddəsinin 1-ci hissəsinin 5-ci bəndində Milli Məclis tərəfindən məhkəmə quruluşu və hakimlərin statusu, 6-cı bəndində məhkəmə icraatı, məhkəmə

qərarlarının icrası, 95-ci maddənin 1-ci hissəsinin 10-cu bəndində Azərbaycan Respublikası Prezidentinin təqdimatına əsasən Azərbaycan Respublikası Konstitusiya Məhkəməsi, Ali Məhkəmə, Apellyasiya Məhkəmələri hakimlərinin təyin edilməsi, prezidentin impiçment qaydasında kənarlaşdırılması kimi səlahiyyətlər nəzərdə tutulmuşdur. Azərbaycan Respublikası Milli Məclisi 94-cü maddənin birinci hissəsinin 5 və 6-cı bəndlərində göstərilmiş məsələlər üzrə 63 səs çoxluğu ilə qanunlar qəbul edir. Ümumiyyətlə hesab etmək olar ki, məhkəmə səlahiyyətləri parlamentlər üçün xarakterik olan səlahiyyətlər deyildir. Məhkəmə səlahiyyətləri məhkəmə hakimiyyətinə xasdır.

Konstitusiyalarda impiçment proseduru, yəni dövlətin vəzifəli şəxslərinin öz vəzifələrində olarkən törətdikləri cinayətlərə görə, parlament təhqiqatı nəzərdə tutulmuşdur. İmpiçment ingilis sözü olub, ağır cinayətdə ittiham etmək deməkdir, impiçment tətbiq olunan şəxs vəzifədən kənarlaşdırılır. Bundan sonra isə adi məhkəmə icraatı həyata keçirilir. İmpiçment o vəzifəli şəxslərə tətbiq olunur ki, onların adi məhkəmə mühakiməsinə qarşı immunitetləri vardır. Bu prosedur ilk dəfə Böyük Britaniyada tətbiq olunub.

Azərbaycan Respublikası Milli Məclisi də yuxanda adlarını çəkdiyimiz ölkələrin parlamentləri kimi amnistiya elan etmək, impiçment tətbiq etmək kimi səlahiyyətlərə malikdir.

Azərbaycan Respublikası Milli Məclisinin səlahiyyətlərinin ümumi xarakteristikası haqqında danışarkən, eyni zamanda onun dövlət orqanları və təşkilatlarının formalaşması, vəzifəli şəxslərin təyin edilməsi, seçilməsi və bu prosedurlarda iştirak etmək, habelə dövlət orqanlarının, təsisatlarının və vəzifəli şəxslərin fəaliyyətinə nəzarət etmək kimi səlahiyyətləri qanunvericilik, icra və məhkəmə hakimiyyətləri arasında tarazlığın təmin edilməsi, "əksdurma və çəkindirmə" sisteminin tələblərinin yerinə yetirilməsi baxımından mühüm əhəmiyyətə malik olmaqla, qanunvericilik hakimiyyətinin digər hakimiyyət qollarına münasibətdə öz funksiyalarını müvəffəqiyyətlə yerinə yetirməsinə, səmərəli təsir mexanizmindən istifadə etməsinə əlverişli şərait yaratmaqla sonda dövlət hakimiyyətinin uğurla, demokratik şəraitdə həyata keçirilməsinə yardım etmiş olur.

## Nəticə

Yuxarıda Azərbaycan Respublikası Milli Məclisinin konstitusion səlahiyyətlərinin əsas xarakteristikalarına toxunuldu. Göründüyü kimi Azərbaycan Respublikasının Konstitusiyası Milli Məclisin səlahiyyətlərini onun müəyyən etdiyi ümumi qaydalar və həll etdiyi məsələlərdən ibarət olmaqla iki qrupa bölür və Milli Məclisin müəyyən etdiyi ümumi qaydalarla həll etdiyi məsələlər arasında fərqli cəhətlər vardır. AR Milli Məclisinin müəyyən etdiyi ümumi qaydalar onun qanunvericilik funksiyası ilə bağlıdır. Azərbaycan Respublikasının Konstitusiyasının 94-cü maddəsi Milli Məclisin müəyyən etdiyi ümumi qaydaları təsbit edir. Azərbaycan Respublikasının Konstitusiyasının 95-ci maddəsində isə Milli Məclis tərəfindən həll edilən məsələlərin dairəsi göstərilmişdir. Milli Məclisin həll etdiyi məsələlər qanunvericilik hakimiyyətini təmsil edən orqan kimi onu icra və məhkəmə hakimiyyəti ilə əlaqələndirən və hakimiyyət bölgüsündə iştirak etməyə imkan verən səlahiyyətlərindən təşkil olunmuşdur. Milli Məclisin səlahiyyətləri müxtəlif şəkildə qruplaşdırılır ki, bu da Milli Məclisin qanunvericilik, maliyyə, beynəlxalq müqavilələrin ratifikasiyası və denonsasiyası, dövlət orqanlarının və təşkilatların formalaşması, vəzifəli şəxslərin təyin edilməsi və ya seçilməsi və bu prosedurlarda iştirak, dövlət orqanlarının, təsisatlarının və vəzifəli şəxslərin fəaliyyətinə nəzarət, müdafiə və təhlükəsizlik sahəsində səlahiyyətlər, məhkəmə səlahiyyətlərini fərqləndirir. Məhz Azərbaycan Respublikasının Konstitusiyasının 94-cü maddəsində göstərilən sahələr üzrə qanun vermək səlahiyyətini həyata keçirməklə Milli Məclis Azərbaycan Respublikasının dövlət siyasətinin əsaslarını formalaşdırır. Milli Məclisin qanunvericilik səlahiyyəti qanunların qəbul edilməsi ilə bağlı səlahiyyətlər toplusu olub, parlamentin səlahiyyətlərinin əsasını təşkil edir. Azərbaycan Respublikasnın Milli Məclisi dövlət hakimiyyəti orqanları sistemində mühüm yer tutduğuna görə, onun fəaliyyəti və bu fəaliyyətin formaları həm cari qanunvericilik, həm də konstitusiya çərçivəsində dəqiq nizama salınan orqandır. Milli Məclisin fəaliyyətinə hakimiyyət bölgüsü çərçivəsində nəzarət edilir, bu fəaliyyətin nəticələri hüquqi fakt hesab olunaraq müəyyən dəyişikliklərə səbəb olur. Milli Məclisin fəaliyyəti onun Daxili Nizamnaməsi ilə müəyyənləşdirilir. Daxili Nizamnaməyə görə, Milli Məclis öz fəaliyyətini aşkarlıq, siyasi plüarizm, çoxpartiyalılıq, məsələlərin sərbəst müzakirə olunması və müstəqil həll edilməsi prinsipləri əsasında qurur. Parlamentin əsas funksiyaları baxımından onun qanunvericilik səlahiyyətləri mühüm amildir. Qəbul olunan qanunlar cəmiyyətin və dövlətin ictimai həyatına bilavasitə təsir göstərdiyindən, bu sahədə tədqiqatların aparılması aşkar olunan qüsurların aradan qaldırılması və qəbul edilən qanunların keyfiyyətinin yüksəldilməsi üçün konkret təkliflərin işlənib hazırlanmasına təkan verəcək mühüm amildir.

### Ədəbiyyat

1. Azərbaycan Respublikasının Konstitusiyası. "Hüquq Yayın Evi", Bakı, 2018. 92 s.
2. Əliyev Q.S. Milli Məclisə Seçkilərin hüquqi əsasları. Bakı: Azərbaycan Demokratiyanan inkişaf fondu, 2000,146 s.
3. Əsgərov Z.A. Konstitusiya hüququ. Dərs vəsaiti. Bakı: Bakı Universiteti nəşriyyatı 2002, 632 s.
4. Беджгот В. Государственный строй Англии. М.: М. и С.Сабашниковы, 1905, 359 с.
5. Беджгот В. Государственный строй Англии. М.: М. и С.Сабашниковы, 1905, 359 с.
6. www.e-qanun.az

### Constitutional characteristics of the powers of the National Assembly of the Republic of Azerbaıjan

### Summary

On October 30, 1991, the Constitutional Law on the Establishment of the Milli Majlis of the Republic of Azerbaijan was adopted. Article 81 of the Constitution of the Republic of Azerbaijan states that the legislative power in the Republic of Azerbaijan is exercised by the Milli Majlis of the Republic of Azerbaijan. When the Milli Majlis of the Republic of Azerbaijan plays an important role in the implementation of the "deterrence and opposition" system, which is important for the constitutional development of the state, the legislature justifies the people's trust, exercises control over the activities of bodies dealing with foreign affairs through the ratification and ratification of international agreements. The main feature that distinguishes the Milli Majlis of the Republic of Azerbaijan from other state authorities is its representative nature and the exercise of legislative power only by this body. This branch of government, as the highest representative institution, has the highest position among the three branches of government due to its closer ties with the electorate, the legal scale and legal norms of state and public life.

### Конституционная характеристика полномочий Милли Меджлиса Азербайджанской Республики

### Резюме

30 октября 1991 года был принят Конституционный закон об учреждении Милли Меджлиса Азербайджанской Республики. В статье 81 Конституции Азербайджанской Республики говорится, что законодательная власть в Азербайджанской Республике осуществляется Милли Меджлисом Азербайджанской Республики. Когда Милли Меджлис Азербайджанской Республики играет важную роль в реализации системы «сдерживания и оппозиции», которая важна для конституционного развития государства, законодательная власть оправдывает доверие народа, осуществляет контроль за деятельностью органов, занимающихся иностранными делами, путем ратификации и ратификации международных соглашений. Главной особенностью, которая отличает Милли Меджлис Азербайджанской Республики от других государственных органов, является его представительный характер и осуществление законодательной власти только этим органом. Эта ветвь власти как высшее представительное учреждение занимает наивысшую позицию среди трех ветвей власти благодаря своим более тесным связям с электоратом, правовым масштабом и правовыми нормами государственной и общественной жизни.

**Rəyçi: dos. Ə.Məmmədov**

Göndərilib: 22.06.2020 Qəbul edilib: 24.06.2020

DOI: 10.36719/AEM/2007-2020/55/112-114

**Севиндж Сулиддин гызы Гусейнли**
Баку, Азербайджан
sevinj.huseynli@gmail.com

# ПРИНЦИП НЕПРИМЕНЕНИЯ СИЛЫ

***Ключевые слова:*** *неприменение силы, Устав ООН, принципы*
***Açar sözlər:*** *güc tətbiq etmətmək , BMT-nin Nizamnaməsi, prinsiplər*
***Key words:*** *non use of force, United Nations Charter, principles*

Идея недопустимости решения спорных вопросов между государствами путем войны высказывалась мыслителями и политическими деятелями многих стран начиная с глубокой древности. Однако найти свое воплощение в договорной форме она смогла лишь в XX веке.

Появившийся в международном праве в период между двумя войнами, сначала как принцип запрещения агрессивной войны, принцип неприменения силы или угрозы силой заменил существовавший ранее право государств на войну (jus ad bellum). Толкование этого принципа дается в Декларации о принципах международного права, касающихся дружественных отношений и сотрудничества государств 1970 года, Манильской декларации о мирном разрешении международных споров 1982 г., Определении агрессии, принятой Генеральной Ассамблеей ООН в 1974 г., Заключительном акте Совещания по безопасности и сотрудничеству в Европе 1975 года, Парижской хартии мира для Европы и Декларации об усилении эффективности принципа отказа от угрозы силой или ее применения в международных отношениях, принятой Генеральной Ассамблеей ООН 18 ноября 1987 г., и др.

Для контроля международной безопасности первоочередным представляется рассмотрение принципа неприменения силы или угрозы силой, впервые зафиксированного в Уставе ООН (п.4 ст.2 и ст.51).

Согласно принципу запрещения применения силы или угрозы силой все государства - члены ООН «воздерживаются в их международных отношениях от угрозы силой или ее применения как против территориальной неприкосновенности или политической независимости любого государства, так и каким-либо другим образом, несовместимым с целями Объединенных Наций» (п. 4 ст. 2).

Обязанность неприменения силы распространяется на все государства, поскольку поддержание международного мира и безопасности требует, чтобы все государства, а не только члены ООН, придерживались в отношениях друг с другом указанного принципа.

Согласно Уставу ООН запрещается не только применение вооруженной силы, но и невооруженное насилие, которое носит характер противоправного применения силы.

Термин «сила», содержащийся в п. 4 ст. 2 Устава, как и сам принцип, не может рассматриваться изолированно, а должен толковаться во всей совокупности прав и обязанностей государств, определенных Уставом. В заключительном акте ОБСЕ (раздел, касающийся претворения в жизнь согласованных принципов) прямо указывается, что государства-участники будут «воздерживаться от всех проявлений силы с целью принуждения другого государства-участника», «воздерживаться от любого акта экономического принуждения». (5:3)

Все это, бесспорно, свидетельствует о том, что современное международное право запрещает противоправное применение силы в любом ее проявлении.

Рассматривая содержание принципа неприменения силы и угрозы силой, следует отметить, что в соответствии с п. 4 ст. 2 Устава «все Члены ООН воздерживаются в их международных отношениях от угрозы силой или ее применения как против территориальной неприкосновенности или политической независимости любого государства, так и каким-либо другим образом, несовместимым с целями Объединенных Наций». Положение данного принципа полностью отражается в п. II Заключительного акта Совещания по безопасности и сотрудничеству в Европе, в котором указывается, что никакие соображения не могут использоваться для того, чтобы обосновывать обращение к угрозе силой или к ее применению в нарушение этого принципа. (4:6)

Принцип о неприменении силы и угрозы силой, наряду с другими принципами международного права, нашел свое отражение и в Уставе Содружества Независимых Государств, который был *принят 22 января 1993 г. в г. Минске на заседании Совета глав государств.* В ст. 3 Устава СНГ, в частности, указывается, что «для достижения целей Содружества государства члены, исходя из общепризнанных норм международного права и Хельсинкского Заключительного акта, строят свои отношения в соответствии с принципами, совпадающими с принципами международного права, среди которых важное место занимает принцип неприменения силы или угрозы силой против политической независимости государства-члена СНГ.

По своей сущности принцип неприменения силы и угрозы силой означает:

• запрещение оккупации территории другого государства в нарушение норм международного права;

• запрещение актов репрессалий, связанных с применением силы;

• предоставление государством своей территории
другому государству, которое использует ее для совершения агрессии против третьего государства;

• организацию, подстрекательство, оказание помощи или участие в актах гражданской войны или террористических актах в другом государстве;

• организацию или поощрение организации вооруженных банд, иррегулярных сил, в частности, наемников для вторжения на территорию другого государства [3:34].

Если рассмотреть вкратце содержание рассматриваемого принципа, то можно отметить следующее:

*Во-первых,* «запрещение оккупации территории другого государства в нарушение норм международного права» предполагает запрет оккупации всей или части территории другого государства как путем применения военной силы, так и путем использования иррегулярных войск, наемников, частных военных организаций. Оккупация, в отличие от аннексии, означает установление временного контроля над территорией суверенного государства или ее части, а не установление над ним суверенитета. Однако на практике встречаются случаи оккупации части территории другого государства и создание на ней марионеточного режима, через который полностью контролируется такая территория и где не допускаются представители международных организаций. Оккупированная территория в данном случае де-юре в соответствии с международным правом является частью другого государства, но по сути фактически она может находиться под полным контролем агрессора.

На наш взгляд элементом угрозы является демонстрация военной или иной вооруженной силы и вооружений непосредственно вблизи границы независимых государств для их запугивания и оказания на них определенного воздействия с целью ограничения суверенитета государства на части своей территории, которая может выражаться в проведении военных учений и маневров или концентраций военной силы у границ сопредельного государства.

*Во-вторых,* «запрещение актов репрессалий, связанных с применением силы» по своей сути означает применение принудительных мер одним государством в ответ на неправомерные действия другого государства, нарушающие принципы международного права, международных и межгосударственных договоров. Однако применение в отношении государств-нарушителей (военной) силы не допускается, так как это может быть расценено как акт агрессии. При этом могут быть применены в отношении государств-нарушителей соответствующие (контр) меры политического и экономическкго характера (например, санкции в виде эмбарго, бойкота, замораживания вкладов, введение индивидуальных санкций в отношении отдельных лиц и структур) с целью их принуждения к выполнению принятых на себя международных обязательств.

*В-третьих,* «предоставление государством своей территории другому государству», которое использует ее для совершения агрессии против третьего государства, предполагает целенаправленное действие государств, предоставляющих свою территорию другому государству по размещению военной инфраструктуры, вооруженных, иррегулярных и иных сил для совершения агрессии против других государств. В подобных случаях государство, предоставившее свою территорию другому государству для совершения агрессии против суверенных государств, должна нести ответственность наравне с агрессором. При этом предоставление государством своей территории для размещения военной инфраструктуры другому государству и военному блоку или организации с целью самообороны или коллективной безопасности не должно рассматриваться в указанном контексте.

*В-четвертых,* «организация, подстрекательство, оказание помощи или участие в актах гражданской войны или террористических актах в другом государстве» с точки зрения международного права понимается как грубейшее нарушение основополагающих принципов и норм международного права. Такие действия в основном направлены против суверенитета и территориальной целостности суверенных государств, их политического и экономического курса. Под организацией в данном случае понимается создание органа (центра, штаба), который берет на себя организацию, руководство и разработку плана участия в актах гражданской войны или совершения террористических актов, а также совершение иных действий, связанных с финансированием, подысканием и подбором участников, обеспечением их амуницией, оружием, боеприпасами, транспортом и т.д. Под подстрекательством «к актам гражданской войны или террористическим актам» следует понимать преднамеренное распространение ложных сведений провокационного характера, умышленное создание очагов напряжения, разжигание конфликтных ситуаций, убийство граждан и т.д.

*В-пятых,* организация или поощрение организации вооруженных банд, иррегулярных сил, в частности, наемников, для вторжения на территорию другого государства предполагает, как было указано выше, создание, сговор, подыскание и подбор участников вооруженных банд, иррегулярных сил, наемников, добровольцев их руководства, разработка плана действия, финансирование, оснащение,

вооружение, обеспечение транспортом и т.д. поощрением в данном контексте следует понимать материальное и моральное поощрение за организацию вооруженных банд, иррегулярных сил, добровольцев и наемников для вторжения на территорию другого государства. Кроме поощрения материального характера следует рассматривать и поощрение морального свойства, например, публичное восхваление и героизация противоправных действий деструктивных сил на территории другого государства через СМИ в глазах населения. (1:77)

Практика последних лет подтверждает, что задача безусловного утверждения принципа неприменения силы в международной жизни, к сожалению, не сошла на нет, а, напротив, стала еще более актуальной. С момента создания ООН человечество проделало огромный путь, мир значительно изменился. Эти изменения одновременно таят в себе и новые возможности, и новые опасности.

Международная безопасность, как это отмечалось в Декларации об усилении эффективности принципа отказа от угроз силой или ее применения в международных отношениях, одобренной на 42-й сессии Генеральной Ассамблеи ООН в 1987 г., должна основываться на принципах отказа от применения силы, мирном сосуществовании государств с различными социальными системами и праве свободного выбора и независимого развития каждой страны.

В декларации последовательно проводится мысль о том, что международная безопасность складывается из безопасности в различных регионах, и указывается, что государства - участники региональных соглашений или органов должны рассматривать возможность более широкого использования таких соглашений и органов для разрешения вопросов, относящихся к поддержанию международного мира и безопасности, в соответствии со ст. 52 Устава ООН. Таким образом, в декларации нашла отражение идея, не утратившая свою актуальность и сегодня, что в борьбе за всеобщую безопасность, за исключение войны из жизни общества должны быть задействованы все международные институты и формы, и прежде всего такой универсальный орган сотрудничества государств, как Организация Объединенных Наций.( 2)

**Литература**

1. Черниченко С.В. Теория международного права. Т. 2: Старые и новые теоретические проблемы. – М.: Изд-во «НИМП», 1999.
2. Устав Организации Объединенных Наций от 26 июня 1945 г. / Меж- дународное право в документах / Сост.: Н.Т.Блатова, Г.М.Мелков. – М., 2000.
3. Тузмухамедов, Б. От политических деклараций — к правовым доводам
4. Правовое регулирование применения силы в международных отношениях2010 / Опарина Марина Владимировна
5. Мирное разрешение международных споров без применения силы или угрозы силой -основа современного международного правопорядка2015 / И.К. Шаов

**Güc tətbiqindən çəkinmə prinsipi**
**Xülasə**

BMT Nizamnaməsinin müddəaları bütün üzv dövlətləri öz beynəlxalq öhdəliklərinə əməl etməyə və mübahisəli məsələləri beynəlxalq təhlükəsizliyə münasibətdə dinc üsulla həll etməyə səsləyir. BMT Nizamnaməsi təhlükəsiz beynəlxalq aləmin qurulmasında dərin rol oynayır. BMT Nizamnaməsinin 2-ci maddəsi dövlət suverenliyi və siyasi müstəqilliyi təhlükə altına alan güc tətbiq edilməsinə dair qadağanı nəzərdə tutur. Bundan əlavə, 2-ci maddə müasir müharibə vasitələrinin real qiymətləndirilməsi üçün əla nümunədir və müharibə cinayətlərinin və 1949-cu il Cenevrə Konvensiyasına əsasən vacib normaların pozulmasının qarşısını almaq üçün vacib bir müddəa kimi qəbul edilməlidir.

**Principle of non-use of force**
**Summary**

The provisions of UN Charter call upon all member-States to comply with their international obligations and regulate all contentious matter in a peaceful way with respect to the international security. The UN Charter being the binding instrument plays a profound role in building the safe international arena. According to the Article 2 of UN Charter, it's evident that, the provision envisages the prohibition of resorting to use of force which jeopardizes the State Sovereignty and political independencd. Furthermore, Article 2 is a great illustration for the real assesment of contemporary means of war and should be considered as essential provision for impediment of war crimes and prevention the violations of important norms under the Geneva Conventions 1949.

**Rəyçi: prof.R.Məmmədov**

Göndərilib: 17.06.2020 Qəbul edilib: 19.06.2020

**FƏLSƏFƏ VƏ SOSİOLOGİYA PHILOSOPHY AND SOCIOLOGY**
**ФИЛОСОФИЯ И СОЦИОЛОГИЯ**

DOI: 10.36719/AEM/2007-2020/55/115-119

**Firəngiz Tərlan qızı Heybətova**
Azərbaycan Dövlət İqtisad Universiteti
f.heybetova@mail.ru

# AZƏRBAYCANDA TİBBİ SIĞORTANIN MÖVCUD VƏZİYYƏTİ

***Açar sözlər:*** *sığorta, tibbi sığorta, icbari tibbi sığorta*
***Key words:*** *insurance, health insurance, compulsory health insurance*
***Ключевые слова:*** *страхование, медицинское страхование, обязательное медицинское страхование*

## Giriş

Dünya praktikası göstərir ki, icbari tibbi sığorta sistemləri əhalinin tibbi xidmətlə ümumi əhatəsini təmin edir. Müxtəlif ölkələrdə icbari tibbi sığortanın həyata keçirilməsinin və fəaliyyət göstərməsinin məqsədlərindən asılı olmayaraq, icbari tibbi sığorta sisteminin davamlılığı və effektivliyini təmin edən ümumi fəaliyyət mexanizmləri və inkişaf meylləri mövcuddur.

İcbari tibbi sığorta fondları, bütün sosial tərəfdaşların nəzarət şuraları və ya digər qurumlar vasitəsilə idarəetmədə yüksək dərəcədə iştirakı ilə yüksək səviyyəli muxtariyyət səviyyəsinə malikdir.

İcbari tibbi sığorta sisteminin müxtəlif elementlərinin fəaliyyətinin özünü tənzimləməsi üçün qanunla müəyyən edilmiş mexanizmlər mövcuddur: idarəetmə orqanlarının formalaşdırılması, tariflərin təyin edilməsi, texnoloji qiymətləndirmə, tibb işçilərinin ixtisaslarının tanınması, tibb işçilərinin akkreditasiyası və s. Bu baxımdan, tibbi sığortanın mövcud vəziyyətinin öyrənilməsi aktuallıq kəsb edir.

## Təhlillər

2019-cu il Azərbaycanda genişmiqyaslı islahatlar, ilk növbədə sosial islahatlar ilinə çevrildi. Prezident İlham Əliyevin sərəncam paketləri milyonlarla vətəndaşımıza təsir etdi: maaşlar, pensiyalar, müxtəlif sosial müavinətlər dəfələrlə artdı. Tezliklə ölkənin səhiyyə sektorunda əsaslı bir dəyişiklik olacaqdır. Bu gün ən müasir və axtarılan sosial hadisələrdən birinin - icbari tibbi sığortanın son icrası üçün hazırlıqlar aparılır. Bu proqram sanki ölkənin hər bir vətəndaşını əhatə edəcəkdir [5].

İcbari tibbi sığorta dünyanın çox ölkəsində çoxdan adi hal alıb. 2020-ci ilin yanvarından bu mütərəqqi sığorta sistemi Azərbaycanda tətbiq olunmağa başlayacaq.

Bu yeniliyə hazırlıqlar bir neçə il əvvəl başladı. Bir sıra mərhələlər keçildi ki, bu da ölkənin səhiyyə sisteminin və sığorta sisteminin əsasən bu prosesə nə dərəcədə hazır olduğunu müəyyən etməyə imkan verdi.

İcbari tibbi sığorta vətəndaşların dövlətdən pulsuz tibbi yardım almaq hüquqlarına riayət olunmasını təmin edən bir sistemdir. Azərbaycan Nazirlər Kabineti yanında 2016-cı ilin fevral ayında fəaliyyətə başlayan İcbari Tibbi Sığorta üzrə Dövlət Agentliyi icbari tibbi sığortanı həyata keçirəcək, tibbi xidmətlərin maliyyələşdirilməsi üçün vəsait toplayacaq, habelə tibbi xidmətlər alacaq və tibbi xidmət üçün bütün zəruri xərcləri ödəyəcək. 2018-ci ildən Agentlik ictimai hüququn hüquqi subyekti kimi fəaliyyət göstərir [4].

Azərbaycanda icbari tibbi sığorta sisteminin subyektləri bunlardır: Tibbi xidmətlər, tibb müəssisələrini müəyyən edən və maliyyələşdirən İcbari Tibbi Sığorta Agentliyi - xidməti sifariş edən və sığorta olunanlar - bu xidmətlərdən istifadə edəcək əhali, siyasətçilər - müvafiq icra hakimiyyəti orqanlarının səlahiyyət verdiyi orqanlar (təşkilatlar), sığorta müqaviləsinin tərəfi olan və məcburi olaraq sığorta haqları ödəməli olan yerli hüquqi şəxslər kimi tibbi sığorta, habelə tibbi xidmət göstərənlər - "Şəxsi tibbi fəaliyyət haqqında" Azərbaycan Respublikasının Qanununa uyğun olaraq özəl tibb fəaliyyəti və özəl tibbi təcrübə ilə məşğul olan hüquqi və fiziki şəxslər, habelə dərman vasitələri haqqında "Azərbaycan Respublikasının Qanununa uyğun olaraq əczaçılıq fəaliyyəti ilə məşğul olan hüquqi və fiziki şəxslər.

Başqa sözlə, proses aşağıdakı kimi aparılır: bir vətəndaş şəxsiyyətini təsdiqləyən sənədlə tibb müəssisəsinə gəlir, qəbul şöbəsində məlumatları elektron bazaya daxil edilir, sonra müvafiq mütəxəssisə müraciət edir, bu da öz növbəsində xəstənin tibbi tarixini, diaqnozu göstərir. Göstərilən xidmətlərə görə xəstəxana hesabına pul köçürməzdən əvvəl, İcbari Tibbi Sığorta Agentliyi tibbi-iqtisadi müayinə və vətəndaşlara göstərilən tibbi xidmətin keyfiyyətini yoxlayır.

Azərbaycanda icbari tibbi sığortanın hərtərəfli həyata keçirilməsinə hazırlıq 3 il əvvəl Mingəçevir, Yevlax və Ağdaş rayonlarında pilot layihənin həyata keçirilməsi ilə başladı.

İcbari tibbi sığortanın fərqli cəhətlərdən olan vətəndaşların sosial təhlükəsizliyinə müsbət təsir göstərəcəkdir. Əvvəla, həmrəylik prinsipinə əsaslanan icbari tibbi sığorta agentliyinin büdcəsi bütün vətəndaşlara tibbi xidmət almaq üçün bərabər hüquqlar təmin edəcəkdir. İşsiz, aztəminatlı və yetkinlik yaşına çatmayanlar eyni miqdarda tibbi xidmətlər, habelə əhalinin gəlirli təbəqələrinə sahib ola bilərlər.

İcbari tibbi sığortanın tətbiqi vətəndaşların sosial-iqtisadi rifahına və ölkənin ümumi inkişafına müsbət təsir göstərəcəkdir. İlk növbədə həkimlərin maaşı artacaq. Xidmətlərin sistemləşdirilməsi, rəqəmsallaşdırılması, elektron xidmət sistemlərinin tətbiqi, çağırışların müvafiq xidmət qruplarına (əvvəlcə ailə həkimlərinə, sonra isə ixtisaslaşmış həkimlərə) yönəldilməsi alqoritmi həm vətəndaşlara, həm də həkimlərə müsbət təsir göstərəcəkdir.

Ümumdünya Səhiyyə Təşkilatının baş direktorunun sözlərinə görə, "icbari tibbi sığorta sosial yük deyil, insan kapitalına qoyulan bir sərmayədir" deyən analitik ölkədə neftə yatırımın insan kapitalına qoyulan investisiya ilə əvəz olunduğunu qeyd etdi. İcbari tibbi sığorta bu sərmayənin yaxşı bir nümunəsidir və səhiyyənin maliyyələşdirilməsinin ən təsirli və effektiv üsulu hesab edilə bilər. Beləliklə, icbari tibbi sığortanın tətbiqi tibbi xidmətin keyfiyyətinin yaxşılaşdırılması, səhiyyə infrastrukturunun yaxşılaşdırılması və bununla da vətəndaşlar üçün sistemli, daha səmərəli, səmərəli və bərabər xidmətlərin göstərilməsində təsirli vasitə rolunu oynayacaqdır [2].

Dövlət İcbari Tibbi Sığorta Agentliyi "TƏBİB dövlət hüquqi şəxsinin tabeliyində olan tibb müəssisələrində tibb işçilərinin əmək haqqı sistemi haqqında" Əsasnaməni təsdiqləyib. Reqlamentə əsasən, tibb işçisinin əmək haqqı vəzifəsindən, iş stajından və işin qiymətləndirilməsindən, iş şəraitinə görə müavinətdən, əmək məcəlləsində nəzərdə tutulmuş digər ödənişlərdən asılı olaraq təyin olunan rəsmi əmək haqqından (tarif dərəcəsindən) ibarətdir.

Aşağıda tibb işçiləri üçün maaş artımının təmin olunduğu iş şərtləri göstərilir:

- sağlamlıq üçün təhlükə və çətin iş şəraiti üçün;
- sağlamlıq üçün təhlükəli və xüsusilə ağır iş şəraiti üçün;
- əldə edilmiş immun çatışmazlığı sindromu (AİDS) və insan immun çatışmazlığı virusu (HİV) ilə əlaqəli iş şəraiti üçün;
- ixtisas səviyyəsinə görə;
- davamlı təcrübə üçün;
- gecə iş üçün;
- iş şəraitinin xüsusiyyətləri üçün;
- mürəkkəblik, gərginlik, işin yüksək keyfiyyəti və yüksək əmək nəticələri üçün.

Tibb işçilərinin əmək haqlarına həvəsləndirici müavinətlər tutduqları vəzifədən və xidmət üçün sabit və ya həvəsləndirici müavinət şəklində görülən işin xüsusiyyətlərindən asılı olaraq ödənilir.

Vəzifə xüsusiyyətlərindən və bəzi həkimlərin aylıq rəsmi əmək haqqına (tarif dərəcəsinə) uyğun stabil və təşviqedici müavinətlərin müvafiq tibb ixtisası (vəzifəsi) mütəxəssisləri ilə xəstələrin müraciətlərinin qeyd olunmasının xüsusiyyətləri nəzərə alınmaqla aşağıdakı kimidir [7]:

**Cədvəl 1. Həkimlərin maaşına həvəsləndirici bonusun miqdarı**

| İxtisası / vəzifəsi adı | Həkimlərin maaşına həvəsləndirici bonusun miqdarı |
|---|---|
| Həkimlərinə müavinət hesablanan şöbə (şöbə) müdirləri | 100 manat |
| Səhiyyə xidmətləri təşkilatının həkimləri (diş həkimi istisna olmaqla) | 200 manat |
| Əczaçı mövqeyində həkimlər | 260 manat |
| Ailə həkimi olaraq çalışan həkimlər | 300 manat |
| Laboratoriya həkimi kimi çalışan həkimlər<br>Statistikaya ixtisaslaşan həkimlər | 340 manat |
| Ailə Sağlamlığı Mərkəzində bir şöbə müdiri olaraq çalışan həkimlər<br>Reanimatoloq işləyən həkimlər<br>Qadın məsləhətxanalarının və ailə sağlamlıq mərkəzlərinin mama-ginekoloqları | 480 manat |
| Aptek şöbəsinin müdiri işləyən həkimlər | 570 manat |

Qeyd: Bundan əlavə, həkimlərə xidmət üçün təşviq mükafatları verilir
Mənbə: Həkimlərin əməkhaqlarına əlavələr tətbiq ediləcək, https://its.gov.az/bloq/hekimlerin-emekhaqlarina - elaveler-tetbiq-edilecek

Bundan əlavə, tibbi ixtisaslar / vəzifələr tərəfindən göstərilən xidmətləri ölçmək və qiymətləndirmək üçün həkimlərə xidmət üçün təşviq mükafatları verilir. Optimal iş yükü və iş saatları nəzərə alınmaqla, tibbi xidmətlərin yuxarı kəmiyyət dərəcəsi məhduddur və yuxarı kəmiyyət standartından artıq olduqda göstərilən tibbi xidmətlər üçün əlavə ödəniş ödənilmir.

Hər gecə növbəsi üçün reanimasiya şöbəsinin həkimlərinə 30 manat əlavə pul verilir; gecə növbəsində tibbi xidmət göstərən hər bir xəstə üçün - 5 manat.

Sabit təşviq müavinətləri mükafat kateqoriyasına uyğun olaraq təcili yardım və təcili tibbi yardım xidmətlərinin rəhbərləri, həkimləri və dispetçerlərinin aylıq rəsmi əmək haqqına (tarif dərəcəsinə) tətbiq edilir.

Tibbi işçilərə təhlükəli və çətin iş şəraitində işləmək üçün rəsmi əmək haqqının (tarif dərəcəsinin) 15% -i, təhlükəli və xüsusilə ağır iş şəraitində işləmək üçün 20% -lə, əldə edilmiş immun çatışmazlığı sindromu (AİDS) və insan immun çatışmazlığı virusu (HİV .işlə əlaqəli şəraitdə işləmək üçün 60% aylıq bonus ödənilir [7].

Yaşayış yerlərindən uzaq kənd və qəsəbələrdə işləyən və sabit təşviq müavinəti alan həkimlərə sabit müavinətlər də verilir.

Gecə işinə birbaşa cərrahiyyə, reanimasiya, mamalıq, ginekologiya və təcili yardım sahəsində (tibb şöbəsi, şöbə, stansiya, ofis və s.) məşğul olan tibb müəssisələrinin həkimlərinə gecə növbəsində hər iş saatı üçün rəsmi əmək haqqı (tarif dərəcəsi) üzrə saatda 50% bonus verilir. Təcili yardım işçilərinə münasibətdə - Qaydanın 17.4-cü bəndində göstərilən sabit həvəsləndirici mükafatın 35% -i, digər işçilər üçün isə rəsmi əmək haqqının 35% -i miqdarında (tarif dərəcəsi).

2018-ci ildə Dövlət İcbari Sığorta Agentliyində tibb işçiləri tərəfindən həkimlərə edilən ziyarətlərin sayı 1,1 milyon təşkil edib. 2017-ci illə müqayisədə həkim ziyarətlərinin sayı 27% artmışdır. Evə yazılmış xəstələrin sayı 21454, əməliyyatların sayı isə 9.346 təşkil etdi.Hər xəstələrin 60% -i və əməliyyatların 74% -i Mingəçevir şəhər mərkəzi xəstəxanasında edildi.

Bu tibb işçilərinin fəaliyyətini optimallaşdırmaq və nəticədə maliyyə ehtiyatlarına qənaət etmək üçün bir sıra tədbirlər görülmüşdür. 2016-cı illə müqayisədə pilot ərazilərdə yataqlarda keçirilmiş günlərin orta sayı 11,7-dən 4,6-a düşdü. Bundan əlavə, 2018-ci ildə Ağdaş bölgəsində yataq tədarükçüsü optimallaşdırıldı və çarpayıların sayı 370-dən 170-ə endirildi [1].

**Şəkil 1. Pilot ərazilər üzrə cərrahi əməliyyatlar, 2016-2018-ci illər**




**Mənbə:** İcbari Tibbi Sığorta üzrə Dövlət Agentliyinin 2018-ci il üzrə fəaliyyətinə dair HESABAT, https://its.gov.az/files/1/icbari_tibbi_sigorta_uzr_dovlt_agentliyinin_illik_hesabati_2018.pdf

Əsas xəstəlik sinifləri üzrə statistik göstəricilərin təhlili göstərir ki, Agentliyin tabeliyinə verilmiş tibb təchizatçılarında evə yazılan pasiyentlər arasında əsas yeri hamiləlik, doğuş və zahılıq dövrü ilə bağlı

müraciətlər tutur. Doğuşun fizioloji proses olduğunu nəzərə alsaq, pilot ərazilərdə əhalinin əsas xəstəlikləri tənəffüs, həzm, qan dövranı və sidik-cinsiyyət sistemlərində olan şikayətlərdən ibarət olmuşdur. İTS-nin tətbiq olunduğu birinci ildə əvvəlki il ilə müqayisədə pasiyentlərin ümumi sayında 24.4% artım olmuşdur. 2018-ci ildə isə 2017-ci il ilə müqayisədə pasiyentlərin ümumi sayında 11% azalma müşahidə olunmuşdur.

Agentliyin tabeliyinə verilmiş tibb təchizatçılarının 2018-ci ildə stasionar fəaliyyətinin 80%-i tənəffüs (19%), həzm (14%), qan dövranı (13%), sidik-cinsiyyət (6%) sistemləri xəstəlikləri və hamiləlik, doğuş və zahılıq dövrü (28%) ilə bağlı olmuşdur. Buna dair məlumat aşağıdakı diaqramda əks olunmuşdur:

**Şəkil 2. Agentliyin tabeliyinə verilmiş tibb təchizatçılarında evə yazılan pasiyentlərin əsas xəstəlik sinifləri üzrə bölgüsü, 2018-ci il üzrə**




**Mənbə**: İcbari Tibbi Sığorta üzrə Dövlət Agentliyinin 2018-ci il üzrə fəaliyyətinə dair HESABAT, https://its.gov.az/files/1/icbari_tibbi_sigorta_uzr_dovlt_agentliyinin_illik_hesabati_2018.pdf

Ümumilikdə, pilot layihə əhatəsində 2018-ci il üzrə səhiyyə xərclərinin maliyyələşdirilməsinə 32 660,39 min manat vəsait xərclənmişdir. Bu xərclərin 26 921,34 min manatı Agentliyin tabeliyinə verilən tibb təchizatçılarının (ilkin səhiyyə xidməti daxil olmaqla), 2 307,89 min manatı pilot ərazilərdə baza zərfinə daxil olan tibbi xidmətlərin göstərilməsi mümkün olmayan Agentliklə müqavilə əsasında fəaliyyət göstərən tibb təchizatçılarının, 3 431,16 min manatı isə əvəzləşdirilməyən və dövlət büdcəsinə geri qaytarılan əlavə dəyər vergisinin payına düşür.

## Nəticə

Təhlil göstərir ki, Azərbaycanda məcburi tibbi sığorta sistemində sığorta prinsipləri qismən tətbiq olunur. Sığorta prinsiplərinin kifayət qədər yerinə yetirilməməsi və müvafiq olaraq, Azərbaycan icbari tibbi sığorta sistemində sığorta qurumlarının olmaması maliyyə vəsaitlərinin inzibati idarəetmə təcrübəsi ilə əvəz olunur. Sığorta prinsiplərinin icrası maliyyələşdirmə sistemində iştirakçıların qarşılıqlı əlaqəsi üçün dəqiq müəyyən edilmiş, sabit qaydaları əhatə edirsə, inzibati idarəetmə qeyri-səlis, vaxt dəyişən, tez-tez maliyyə mənbələrinin bölüşdürülməsi və istifadəsinə nəzarət qaydaları ilə xarakterizə olunur.

İcbari tibbi sığorta sisteminin bu ziddiyyəti aşağıda müzakirə olunan bir sıra problemlərin mərkəzində dayanır:

- tibbi xidmətə görə ödənişin yeni metodlarına natamam keçid;
- tibbi xidmət tariflərinin zəif əsaslandırılması, onların həddən artıq fərdi olması;
- özəl tibb təşkilatlarının icbari tibbi sığorta sistemində iştirakına maneələrin saxlanılması;
- sığorta tibb təşkilatlarının rəqabət üçün kifayət qədər əsasları;
- bir kanallı maliyyələşdirmə sisteminə natamam keçid/

İcbari tibbi sığorta sisteminin yaradılması bu sistemin iştirakçıları arasında (səhiyyə orqanları, icbari tibbi sığorta fondları, sığorta tibb təşkilatları, dövlət tibb müəssisələri) resursdan istifadənin səmərəliliyini artırmaq üçün kifayət qədər motivasiyanın formalaşmasına səbəb olmamışdır.

lazımdır ki, Ermənistan bunun müqabilində münaqişənin həlli ilə bağlı siyasi arenada heç bir irəliləyişə nail olmamışdır.

Prezident İlham Əliyev Dağlıq Qarabağ probleminin həllinin uzadılmasının ədalətsizlik olduğunu, münaqişənin həllinə dair Yerevanın təsəvvürünün yanlış və həm də səhv olduğunu vurğulayır. Eləcə də nəzərə alınmalıdır ki, tarixdə baş verənlərə diqqətlə yanaşmaqla regionda gedən proseslərə düzgün və obyektiv münasibət, uzaqgörənliklə verilən qiymət, tariximizin və müasir siyasətimizin bugünkü simasıdır.

Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinin həllinə Ermənistanın münasibətini bildirərkən Prezident İlham Əliyev vurğulayır: "Erməni tərəfi nizamlama prosesini hər vasitə ilə yubatmağa cəhd edir. Artıq razılaşdırılmış məsələlər yenidən Ermənistan tərəfindən müzakirə mövzusu kimi irəli sürülür. Bununla da bu prosesi sonsuzluğa qədər uzatmaq cəhdləri açıq-aydın görünür. Başlıca səbəb də bundadır". Digər səbəblərin isə beynəlxalq ictimaiyyətin özünün qəbul etdiyi beynəlxalq təşkilatların qərarlarına çox laqeyd yanaşmasından, Ermənistanın isə beynəlxalq hüquq normalarını çox kobud şəkildə pozmasından ibarət olduğunu bildirir.

Birmənalı şəkildə vurğulamaq olar ki, iqtisadiyyatı sabit inkişaf edən, dinamik, müasir və regional məsələlərdən əlavə dünya məsələlərində artıq müəyyən çəkiyə malik olan Azərbaycan Respublikasının beynəlxalq nüfuzu getdikcə artır. Şübhə yoxdur ki, Respublikamız öz taleyüklü məsələsi olan Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinin həllində əsas söz sahibi olmaq imicini qazanacaq və bu münaqişənin birdəfəlik həllinə nail olacaq.

Dünyada gedən münaqişə proseslərinə ikili standartlarla yanaşmalar hələ də davam edir. Azərbaycan Prezidentinin ölkənin ərazi bütövlüyünü bərpa etməyə yönəlmiş siyasətinə, işğalçılığa qarşı mübarizəsinə, atdığı addımlara haqsız etirazlarını bildirənlər ermənilərin törətdiyi cinayət əməllərinə açıq-aşkar göz yumur, cinayətkarların layiq olduqları cəzalardan kənarda qalmalarına şərait yaradırlar. Prezident İlham Əliyev Quba Soyqırımı Memorial Kompleksinin açılışında söylədiyi nitq həqiqətləri ortaya qoyur: "... Azərbaycan dövlətinin iradəsinə, qərarlarına heç bir qüvvə təsir edə bilməz. Biz ədaləti bərpa etmişik və bundan sonra da öz siyasətimizdən dönməyəcəyik. Ancaq nə üçün bu məsələ ilə bağlı öz səslərini ucaldanlar bu gün Ermənistanda faşistlərə qoyulan abidələri görmürlər? Nə üçün terror aktları, o cümlədən Avropa ölkələrində bu aktları törədən erməni terrorçuları sərbəst buraxılır və Ermənistana qaytarılır, orada isə onlara qəhrəman kimi münasibət göstərilir? Nə üçün bunu görmürlər? Bu ədalətsizlik nə vaxta qədər davam edəcək? Bu işğal nə vaxta qədər davam edəcək? Beynəlxalq birlik tərəfindən tanınan torpaqlarımız artıq 20 ilə yaxındır ki, işğal altındadır. Dağlıq Qarabağ Azərbaycanın əzəli, tarixi torpağıdır. Azərbaycan BMT-yə üzv olarkən vahid dövlət kimi üzv olmuşdur. Heç bir dövlət bizim ərazi bütövlüyümüzü şübhə altına almır. Nə üçün BMT Təhlükəsizlik Şurasının dörd qətnaməsi icra edilmir? Bütün bu suallar cavabsız qalır. Biz bu suallara cavabları bilirik. Bu məsələnin həll olunmamasının səbəblərini bilirik və bunu açıq ifadə edirik. Ancaq bu suallar havada qalmamalıdır, bu ədalətsizliyə son qoyulmalıdır" [16].

Azərbaycan Respublikası indi hərbi baxımdan Ermənistandan qat-qat üstündür. Bunu 2016-cı il aprel döyüşləri əyani şəkildə gösstərdi və Ermənistan hökumətinə düşmənçiliyə son qoymağın vacib olduğunu anlatdı.

Azərbaycan Respublikasının Prezidenti, Silahlı Qüvvələrin Ali Baş Komandanı cənab İlham Əliyevin göstərişi ilə Milli Ordumuzun aprel döyüşlərindəki böyük qələbəsi bir daha göstərdi ki, Azərbaycan dövləti bu münaqişəni hərbi yolla həll etmək iqtidarına malikdir. Aprel döyüşləri bir daha təkrar olunarsa Ermənistanın bütün işğal planlarının alt-üst olacağı şübhəsizdir. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev Nazirlər Kabinetinin 2016-cı ilin sosial-iqtisadi inkişafının yekunlarına və qarşıda duran vəzifələrə həsr olunmuş iclasında Ermənistanın "nəyə qadir olduğunu" konkret şərh etmişdir: "Özləri etiraf edirlər ki, xarici yardım olmasa, bir həftə ərzində qabağımızda dura bilməyəcəklər" [17, s.136-149].

Aprel döyüşlərindən sonra Azərbaycan prezidenti İlham Əliyevin Minsk qrupunun həmsədrləri ilə görüşdə səsləndirdiyi "Biz bir neçə dəfə bildirmişik ki, məsələnin sülh yolu ilə siyasi həllinin tərəfdarıyıq. Biz yalnız onu istəyirik ki, məsələ həll olunsun. Biz bu gün də danışıqlar prosesinə hazır olduğumuzu bəyan edirik" fikri münaqişənin ədalətli həllinə hər cür hazır olan dövlət başçısının tutduğu yolun konkret və doğru olduğunu göstərir.

Azərbaycan Respublikasının Prezidenti haqqın, ədalətin bərpa olunmasını istəyir və tələb edir. Prezident İlham Əliyevin dedikləri reallıqdır: "Bu gün bizim dövlət büdcəmiz Ermənistandakından təxminən 10 dəfə çoxdur. Bizim təkcə hərbi məsələlərə xərclədiyimiz vəsait Ermənistanın bütün dövlət büdcəsindən təxminən 30-50 faiz artıqdır. Yəni biz bütün başqa parametrlər üzrə böyük üstünlük əldə etmişik - iqtisadi sahədə, siyasi sahədə, dünya birliyində oynadığımız rol baxımından. Bu gün Azərbaycan BMT Təhlükəsizlik Şurasının üzvüdür və dünya tərəfindən böyük dəstəyə malikdir. Bu gün biz artıq fəzaya çıxmışıq. Bizim peykimiz vardır. Bizim iqtisadi inkişafımız çox sürətlidir... Bizim demoqrafik vəziyyətimiz çox müsbətdir. Artıq 10 milyon əhalimiz vardır. Yəni bütün bu amillər bizim gücümüzü təsdiqləyir və düşünülmüş siyasətin

nəticəsidir. Ermənistan isə artıq öz hərəkətləri və bəyanatları ilə açıq şəkildə etiraf edir ki, təhlükəsizliyini öz gücünə təmin edə bilmir. Biz bunu çoxdan bilirdik. Hesab edirəm ki, Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi ilə məşğul olan bütün tərəflər bunu bilir. Ancaq bu gün Ermənistan məcburdur ki, özü bunu etiraf etsin. Bizim qarşımızda nə qədər aciz, nə qədər gücsüz olduğunu, qorxu içində yaşadığını etiraf etsin. Mən bir dəfə demişəm ki, erməni xalqı bizdən qorxmamalıdır, öz rəhbərliyindən qorxmalıdır. Qaniçən, yırtıcı, quldur, cəllad rəhbərliyindən qorxmalıdır ki, bu gün onlar öz xalqına divan tuturlar, öz xalqını güllələbaran edirlər. İndiki Ermənistan rəhbərliyi nə qədər çox hakimiyyətdə qalsa, Ermənistan bir o qədər də tez tamamilə çökəcək və tarixi ədalət bərpa ediləcəkdir. Mən tam əminəm ki, Azərbaycan öz ərazi bütövlüyünü bərpa edəcəkdir. Bütün amillər - güclərin nisbəti, beynəlxalq, iqtisadi-hərbi amillər bunu göstərir. Sadəcə olaraq vaxt gedir. Sadəcə olaraq biz istəyirik ki, bu, tezliklə olsun. Ancaq bu, hərtərəfli və tam şəkildə olmalıdır" [18].

## Nəticə

Ulu öndər Heydər Əliyevin Prezident İlham Əliyevin böyük qətiyyətlə apardığı xarici siyasət Azərbaycan Respublikasının milli maraqlarına tam cavab verməklə, respublikamızın beynəlxalq arenada imicinin daha da güclənməsinə, ölkədə, eləcə də Cənubi Qafqazda sülhün qorunmasına xidmət edir. Azərbaycan Respublikasının malik olduğu iqtisadi potensial, ölkə rəhbərliyi tərəfindən həyata keçirilən kompleks islahatların nəticəsində respublikamızın sülh, əməkdaşlıq və tərəqqi mərkəzinə çevrilməsi, xalqımızın milli maraq və mənafelərini daha etibarlı səviyyədə təmin etməsi, Azərbaycanın sürətli inkişaf yolunda olması Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinin həllində uğurlu nəticə əldə etməyə, bununla da münaqişə vəziyyətində olan respublikalarda, bununla bərabər Cənubi Qafqazda və bütün Qafqaz regionunda sabitlik yaranmasına xidmət edəcəkdir.

## Ədəbiyyat

1. Dirçəliş - XXI əsr, 2003
2. Dirçəliş - XXI əsr, 2003, 64
3. Dirçəliş - XXI əsr, 2003, 64
4. Dirçəliş – XXI əsr, 2004, 71
5. Qasımlı M.C. Azərbaycan Respublikasının xarici siyasəti (1991-2003): 2 hissədə. 11 hissə. - Bakı: Mütərcim, 2015. - 664 s.
6. Türkdilli ölkələrin dövlət başçılarının X zirvə toplantısında İlham Əliyevin nitqi. İstanbul, "Çırağan" sarayı. 16 sentyabr 2010-cu il. islamworld.preslib.az
7. Azərbaycan 2003: İnkişaf strategiyasında yeni mərhələ, Bakı, 2005, 520 s.
8. Dirçəliş - XXI əsr, 2005, № 84-85
9. Türkdilli ölkələrin dövlət başçılarının X zirvə toplantısında İlham Əliyevin nitqi. İstanbul, "Çırağan" sarayı. 16 sentyabr 2010-cu il. islamworld.preslib.az
10. Dirçəliş - XXI əsr, 2003, № 67-68
11. Dirçəliş - XXI əsr, 2003, № 67-68
12. Mehdiyev R.Ə. Milli məfkurə, dövlətçilik, müstəqillik yolu ilə: məqalələr, çıxışlar, müsahibələr. I-II c. Bakı: Yeni nəşlər evi, 2006-2007.- 672 s
13. Azərbaycan qəzeti, 25 sentyabr 2004
14. Əliyev İlham. Azərbaycan prezidenti İlham Əliyevin Fransa Beynəlxalq Əlaqələr İnstitutunda görüşü. // Dirçəliş – XXI əsr, 2004, № 71.
15. Dirçəliş - XXI əsr, 2003, № 67-68
16. Hacıyev Q.Ə. **Prezident İlham Əliyevin fəaliyyətində Dağlıq Qarabağ münaqişəsinin həlli prioritetdir** //Azərbaycan qəzeti. 20.10.2013
17. Hacıyev Q.Ə. Qarabağ müharibəsi hələ bitməmişdir: aprel döyüşləri Ermənistana düşmənçiliyə son qoymağın vacib olduğunu başa saldı. Tarix, insan və cəmiyyət. 2017, 1 (24)
18. Türkdilli ölkələrin dövlət başçılarının X zirvə toplantısında İlham Əliyevin nitqi. İstanbul, "Çırağan" sarayı. 16 sentyabr 2010-cu il. islamworld.preslib.az

## The legacy of Heydar Aliyev and the successful work of Ilham Aliyev to restore lasting peace in the South Caucasus

**Summary**

At the end of the twentieth century, Armenia, which presented unreasonable territorial claims against the Nagorno-Garabakh region of Azerbaijan, launched military aggression against the Republic of Azerbaijan, occupying Nagorno-Garabakh and 7 neighboring regions. Despite the signing of the ceasefire in 1994, the conflict has not yet been resolved. Although the Azerbaijani state fully agrees with possible solutions, taking into account the situation, Armenia does not allow the settlement of the conflict. Despite all this, the great

leader Heydar Aliyev pursued a policy aimed at resolving the conflict on objective terms. The activity of President Ilham Aliyev, who successfully continues the country's domestic and foreign policy, has entered a new stage, which inspires hope that the Armenian-Azerbaijani Nagorno-Garabakh conflict will be resolved in accordance with international law.

**Наследие Гейдара Алиева и успешная деятельность Ильхама Алиева по восстановлению прочного мира на Южном Кавказе**

**Резюме**

В конце двадцатого века Армения, которая предъявила необоснованные территориальные претензии к Нагорно-Карабахскому региону Азербайджана, начала военную агрессию против Азербайджанской Республики, оккупировав Нагорный Карабах и 7 соседних регионов. Несмотря на подписание соглашения о прекращении огня в 1994 году, конфликт до сих пор не урегулирован. Хотя азербайджанское государство полностью соглашается с возможными решениями, принимая во внимание ситуацию, Армения не разрешает урегулирование конфликта. Несмотря на все это, великий лидер Гейдар Алиев проводил политику, направленную на разрешение конфликта на объективных условиях. Деятельность президента Ильхама Алиева, который успешно продолжает внутреннюю и внешнюю политику страны, вступила в новый этап, который вселяет надежду на то, что армяно-азербайджанский нагорно-карабахский конфликт будет решен в соответствии с международным правом.

Göndərilib: 01.07.2020 Qəbul edilib: 03.07.2020

## PSİXOLOGİYA PSYCHOLOGY ПСИХОЛОГИЯ

DOI: 10.36719/AEM/2007-2020/55/133-137

**Vəfa Fuad qızı Qənbərli**
İstanbul, Türkiyə
vefa.ganbarli@mail.ru

# COVID-19 VƏ PSİXOLOJİ SAĞLAMLIĞIN XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *COVID-19, psixoloji sağlamlıq, depressiya, təşviş*
***Key words:*** *COVID-19, psychological health, depression, anxiety*
***Ключевые слова:*** *COVID-19, психологическое здоровье, депрессия, тревожность*

## Giriş

Tarixdə qeydə alınan sonuncu pandemiya 1918-ci ildə meydana çıxmış İspan qripi idi. Hansı ki, bu illərdə müasir psixologiya elmi hələ yaranmamışdı. Bu səbəblə COVID-19-un psixoloji sağlamlığa potensial təsirini araşdırmaq, bir çox sahələr kimi psixologiya elminin də vacib problemlərindən birinə çevrilmişdir. Çindən 2019-cu ilin noyabr ayından etibarən yayılan COVID-19 pandemiyası ilə bağlı aparılan ilkin araşdırmalar, insanlarda depressiya, təşviş və posttravmatik stres əlamətlərinin, yuxunun artdığını göstərmişdir. Hazırda qlobal pandemiya ilə birbaşa əlaqəli psixoloji ədəbiyyatın çatışmazlığı mövcuddur.

Qlobal pandemiya ilk növbədə fərdlərin həyatını, varlığını təhdid edən və hamı üçün əzabverici xüsusiyyəti olan bir travmadır. Bu travmatik təsirlər fərdin sosial iqtisadi vəziyyəti, sosial statusu, mədəni və fərdi xüsusiyyətlərindən asılı olaraq dəyişiklik göstərməkdədir. Bu qeyri standart təcrübənin fərqli dövrlərində verilən psixoloji reaksiyalar da hər bir fərd, qrup, sosial sinif üçün fərqli səviyyələrdə müşahidə olunmaqdadır. Xəstəlik qorxusu, qeyri-müəyyənlik, xəstəliyin özünə və ailəsinə keçə biləcəyi ilə bağlı fikirlər narahatlıq mənbəyi olmaqdadırlar. Eyni zamanda xəstəlik əlamətlərini göstərənlər və onların yaxınları ilə sadəcə müşahidə edən insanların reaksiyaları da tamamilə fərqlidir. Əvvəlki pandemiyalar ardıcıl olaraq psixoloji sağlamlıq problemlərinin artmasına səbəb olmuşdur (Brooks və digərləri, 2020). Məsələn, poliomielit – uşaq iflici epidemiyası zamanı onun simptomları və müalicə şəraiti travmalara səbəb olmuşdur (Wilson, 2008). 2003-cü ildə Honq Konqda ortaya çıxan SARS epidemiyası zamanı artan psixoloji problemlər, təşviş pozuntuları, depressiv əlamətlər, qorxu və narahatçılıq yuxu ilə əlaqələndirilmişdir və artan tənhalıq, təcrid səbəbi ilə yaşlılar arasında intihar hallarının artdığı bildirilmişdir (Yu və digərləri, 2005).

Təşviş, insanın bir problemin öhdəsindən gələ bilməməsi ilə bağlı həddindan artıq düşünməsini, depressiya isə müəyyən bir problem qarşısında daha az stimul və məyusluğu ifadə etməkdədir. Bu kimi gözlənilməz hallarda xəstələr və onlarla ilkin təmasda olan tibb işçiləri koronavirusun emosional təsirinə qarşı daha müdafiəsiz halda olmaqdadırlar. Pandemiyanın ortaya çıxdığı vaxtdan etibarən “Google”-da psixoloji sağlamlıq ilə bağlı axtarışların sayı və sosial təcrid tədbirlərindən sonra intihar düşüncəsi və intihar cəhdləri də artmışdır. Sosial təcrid, beynəlxalq səviyyədə tətbiq olunan məhdudiyyətlər səbəbi ilə bir çox ölkələrdə restoran, otel, turizm və istehsal sahələrində məcburi geriləmələr və qısaca iqtisadi tənəzzül baş verdi. İqtisadi tənəzzül və psixoloji sağlamlıq arasındakı assosiasiyadan yola çıxıb deyə bilərik ki, iqtisadi çətinlik narahatlıq və depressiya ilə mübarizədə mənfi davranışların, yəni alkoqol və narkotik maddə istifadəsini artırdı (Forbes və Krueger, 2019). Bir çox fəaliyyətin onlayn yerinə yetirilməsi səbəbi ilə sosial media asılılığının artması da istisna deyil. Karantinlə yanaşı, sosial təcrid və tənhalıq mövzusunda aparılan tədqiqatlar bu problemin təkcə psixoloji sağlamlıq üçün yox, eyni zamanda fiziki hərəkətsizlik səbəbi ilə piylənmə, narkotik maddə asılılığı kimi fiziki problemlərə də səbəb olduğunu göstərmişdir (Nelson və digərləri, 2020). Əvvəlki yoluxucu xəstəliklərin yayıldığı dövrlərdə tətbiq olunan sosial təcriddən – karantindən sonra insanlarda ciddi qəzəb partlayışlarının ortaya çıxdığı və şəxsiyyətlərarası münaqişələrdən meydana gələn çox sayda məhkəmə işlərinin açıldığı müəyyən olunmuşdur (Lee və digərləri, 2016).

Çin höküməti COVID-19-a yoluxan şəxslərin və onların yaxınlarının, səhiyyə işçilərinin psixoloji sağlamlığının qayğısına qalmaq üçün internet texnologiyasını istifadə edərək yeni bir böhran psixoloji yardım modeli yaratmışdır. Xəstələrə, onların ailələrinə, səhiyyə işçilərinə kömək etmək üçün həkimlər, psixiatrlar, psixoloqlar və sosial xidmət mütəxəssisləri internet platformaları ilə inteqrasiya olunmuş dəstək göstərməkdədirlər. Keçmiş dövrlərdəki yoluxucu xəstəliklərdən sonra aparılan araşdırmalarda, qalıcı ola biləcək simptomlar müşahidə edilmişdir. COVID-19 pandemiyasının da bu nəticələrə əsasən, daha sonra mövcud psixoloji sağlamlıq xidməti təqdim edən mütəxəssislər üçün əlavə problem ola biləcəyini düşündürməkdədir.

Aparılan bir başqa araşdırmada karantin ilə bağlı aparılan onlayn anketlərə qatılanların təxminən üçdə birinin depressiya və ya travma sonrası stress pozuntusu əlamətləri göstərdiklərini ortaya qoymuşdur. Karantinaya alınan insanlar ənənəvi üz-üzə ünsiyyəti itirir və bu da ciddi stress faktoru olaraq qəbul oluna bilər.

COVID-19 pandemiyası nəticəsində insanlarda kəskin fikirlər ortaya çıxmışdır. İnsanların bir qismi problemin varlığını inkar edir, digər bir qismində isə müxtəlif təşviş pozuntuları, qorxular, narahatlıqlar müşahidə olunmaqdadır. Təşviş, hər hansı bir təhlükə səbəbi ilə insanda ortaya çıxan narahatçılıq və ya irrasional qorxu vəziyyəti olaraq qəbul edilmişdir. Sağlamlıqla bağlı təşviş, fərdin sağlamlığıyla bağlı böyük bir təhdid altında olduğu düşüncəsi ilə ortaya çıxan və nəticədə fərdin fiziki və emosional təşviş simptomlarını ortaya çıxardan psixoloji bir təcrübədir. Sağlamlıqla bağlı təşviş, hər hansı bir fiziki problemi olmadığı halda insanın ciddi bir xəstəliyi olduğunu düşünməsi və bu xəstəliyi, "pis nəticələrə yol açacaq" şəklində şərh etməsidir (Aydemir və digərləri, 2013). Ekiz, İlıman və Dönmez apardıqları araşdırmada qadınların sağlamlıqla bağlı təşviş səviyyəsinin kişilərinkinə nəzərən daha yüksək olduğunu müəyyən etmişdir. Eyni zamanda yaş və təhsil səviyyəsi də sağlamlıqla bağlı təşviş ilə əlaqəlidir. 46-55 yaş arasındakı insanlar pandemiyanın mümkün nəticələrinə dair daha tolerant və tədbirlidirlər. Ancaq 56-70 yaşlı və daha yaşlı insanlarda təhlükə ilə bağlı qavrayış daha aşağı səviyyədədir. Təhsil səviyyəsi artdıqca insanların artan şüuru ilə nəzarət tədbirlərinə qarşı müsbət münasibətlərinin də artdığı müşahidə olunmuşdur. Sağlamlıqla bağlı təşviş keçirən insanlar, bədənlərindəki minimal dəyişikliklərə qarşı belə həssas, sağlamlıqları ilə mütəmadi maraqlanan insanlardır. Xüsusilə, səhiyyə işçiləri arasında xəstə ilə birbaşa təmasda olan işçilərdə təşviş, depresiya və obsessiv kompulsiv simptomların birbaşa təmasda olmayanlara görə yüksək olduğu müşahidə olunmuşdur (Tutku, Ilıman, Dönmez, 2020).

Problemin varlığını inkar edən insanların davranışı psixologiyada iki cür ifadə oluna bilər. İd, ego və super eqo arasındakı harmoniyanı təmin etməyə çalışanda, fərdin seçimlər qarşısında qərarsız qalması və ya təşviş keçirməsi ilə psixoloji müdafiə mexanizmləri işə düşür. Fərd adətən bunu şüurlu olaraq başa düşmür, lakin narahatlıq hiss edir. Şüuraltı münaqişələrdən qaynaqlanan təşviş, eqo üçün təhlükəli olaraq qavranıldığından, eqo öz tarazlığını yenidən qurmaq üçün müdafiə mexanizmləri yaradır. Mövcud situasiyada insanların ən çox istifadə etdiyi müdafiə mexanizmləri rasionallaşdırma, proyeksiya və inkardır.

Rasionallaşdırma - dediyimiz məntiqi mülahizələr, insanların davranışlarını məntiqli və mənalı göstərmək üçün çalışması, cəmiyyətin qınağından ehtiyat etdiyi məqamlarda davranışlarını məntiqi formada izah etməsidir. Məsələn: "Mən qoruyucu vasitələrdən istifadə etmirəm, filan alimin dediyinə görə tibbi maska ağız ətrafındakı bakteriyaları artırır". İkinci problemlə əlaqəli olduğunu düşündüyümüz müdafiə mexanizmi proyeksiyadır. Proyeksiya – dediyimiz yansıtma, bu müdafiə mexanizminə sahib insanlar özlərini narahat edən qüsurlarını və çatışmazlıqlarını gizlədib, başqalarını yetərsizlikdə, problemli davranışlarda günahlandırırlar. Kifayət qədər qorunduğuna əmin ola bilməyən insanlar başqalarını qaydalara riayət etməməkdə günahlandırır və ya məsuliyəti öz üzərindən atırlar. Məsələn: "tibbi maska xəstələrin taxması üçündür, mənim heç bir problemim yoxdur". Halbuki heç kim daşıyıcı olub olmadığını bilə bilməz. İnkar etmək - isə, mənlik üçün təhlükəli olaraq qavranılan və təşviş yarada biləcək bir həqiqəti yox saymaq mənasına gələn primitiv bir müdaifə mexanizmidir. Məsələn: "xəstəlik filan yoxdur, heç ətrafınızda, qohumlarda virusa yoluxan var?". Bu mexanizm eynilə ölümcül xəstə olan insanların güc tapmaq üçün bunu inkar etməsi, ölən bir yaxınının sanki geri qayıdacaqmış kimi otağını, yatağını hazır vəziyyətdə saxlaması kimidir. İlk növbədə problemin varlığını inkar edən insanlar, reallığı bir müddət rədd edərək, heç bir şey olmamış kimi davranaraq erkən dövrlərdə daxili narahatlığı minimallaşdırmağa çalışırlar. Bu adətən yaşlı insanlarda görülən bir hal olsa da ölkədə gənclərin əksəriyyətində bu hal müşahidə olunmaqdadır. Ancaq araşdırmalar, problemə ilkin reaksiya verən insanların daha sonra bunu ilk başda inkar edən insanlara nəzərən daha az travmatik reaksiyalar göstərdiyini müəyyən etmişdir (Kocaman, 2008).

Leon Festingerin koqnitiv dissonans nəzəriyyəsinə görə də, insanlar hansısa bir fikrə, düşüncəyə həddindən artıq güc, əmək, maddi vəsait sərf edirlərsə onun əksinin sübutları ilə o şəxsə təqdim olunması nəinki o fikirdən daşınmaqlarına, əksinə daha çox onu müdafiə etmələrinə səbəb olmaqdadır (Akhanlı, 2019).

Yanq tərəfindən 1990-cı ildə yaradılan sxem nəzəriyyəsinə görə insanların qeyri adekvat davranışlarının altında adətən uşaqlıq və yeniyetməliyin ilk illərində formalaşmış bir sıra keçmiş təcrübələrin yaratdığı düşüncə sxemləri, inanclar yatmaqdadır. Məsələn: məhdudiyyət tətbiq olunacağını eşidən insanların market rəflərini boşaltması, çarələr axtarması, son dəqiqələrə qədər olduqları şəhəri tərk etməyə çalışmaq və s. Təşviş və qeyri-müəyyənlik insanlarda ehtiyaclar iyerarxiyasında geri düşmək qorxusu və təhlükə olduğu düşüncəsini formalaşdırır. Qida ehtiyaclar iyerarxiyasının ilkin pilləsində yer alan təməl ehtiyaclardan biri olduğundan insanlar xüsusilə bu məsələyə qarşı çox həssasdırlar. Bu davranışlar ac qalmaq qorxusu, əvvəlki müharibə, qıtlıq təcrübələri, çörək növbələri və travmalarının təsiri ilə ortaya çıxmaqdadır. Aclığın və qıtlığın ölməkdən daha dəhşətli olduğu düşüncəsi, "birdən dedikləri vaxtdan daha artıq uzatsalar?" düşün-

cəsi, komfort sahənin dəyişməsi, sürü və mən psixologiyası, “qonşudan geri qalma” prinsipi də bu davranışları açıqlamaqdadır. Bu davranışlar adətən az inkişaf etmiş cəmiyyətin, şüursuz və düşünülməmiş davranışın, avtomatik mühakimənin və ibtidai beyinin hərəkətə keçməsi ilə ortaya çıxan davranışlardır. İbtidai beyin repertuarında olan və insanı təhlükədən qorumaq üçün düşünülməyə ehtiyac duyulmayan davranışları idarə edir. Bu da təkamül nəticəsində insanı təhlükələrdən qorumaq üçün qazanılmış bir xüsusiyyətdir. Sxemlərin də məhz beyində bu şəkildə hazır inanclar formasında qruplaşdığı düşünülür. Davranışlarda görülən sosial məsafəni unudub sırada gözləmək, toplaşmamalı olduğumuz məkanlarda qruplarla dayanmaq insanların əvvəlki təcrübələrində frustrasiyaya uğradılıb ümidsizliyin formalaşdığını göstərməkdədir. Sosial mediadakı informasiya çirkliliyi, keçmiş ağır müharibə şəraiti insanlarda inamsızlıq və qeyri-müəyyənliyə dözümsüzlük, “hər an hər şey ola bilər” düşüncəsini yaratmışdır. Gənc nəsil isə istər-istəməz eşitdikləri, müşahidə etdikləri ilə sosial sirayətə məruz qalıb kütləyə xas davranışlar göstərməkdədirlər (Kömürcü və Gör, 2016).

Sevdiklərimizi itirmək qorxusu, azadlığımızın məhdudlaşdırılması, xəstəliyin gedişatına dair qeyri-müəyyənlik problemə drammatik təsir göstərə bilər, qəzəb partlayışlarına, buna bağlı davranış problemlərinə, ünsiyyət çətinliklərinə səbəb ola bilər. Gündəlik həyatımızda normal şərtlər daxilində qrup içərisində insanlar özlərini daha təhlükəsiz və rahat hiss edəcək şəkildə təkamül ediblər. Lakin mövcud vəziyyətdə nə qədər davam edəcəyinin bilinmədiyi bir vaxta qədər insanlar təcrid olunmuş şəkildə yaşamalı olduğunu görür. Karantin təcrid prosesində əvvəlcə kəskin stress reaksiyaları daha çox müşahidə olunur. Depressiya və təşviş əlamətləri, davranış pozuntularının əlavə etdiyi adaptasiya problemləri ilk və ən geniş yayılmış psixoloji kənara çıxmalardır. Karantin uzandıqca və xəstəlik əlamətləri daha da artdıqca, stress, travma sonrası stres pozuntusu, generalizə olunmuş təşviş pozuntusu, somatik əlamətlər və digər problemlər, hətta psixoz müşahidə oluna bilər. Çoxlarının ailəsi ilə evdə olmasına rəğmən yaşlı insanların 43%-i tək hiss etdiyini bildirir. Bu da şəxsiyyətlərarası münasibətlərdə ciddi problemlər və ünsiyyətin keyfiyyəti ilə bağlı problemləri göstərməkdədir. Prosesin tədricən uzanması, gözlənilən normal həyata qayıtmaq vaxtının irəli çəkilməsi təkrarlanan “xəyalların puç olması” ilə bağlı olaraq ümidsizliyin artması nəticəsində psixoloji əlamətlər xronik hal alır. Qapalı şəraitdə qalmaq əvvəlcədən hər hansı psixoloji xəstəliyi olan şəxslərin simptomlarının kəskinləşməsi ya da ağırlaşmasına səbəb ola bilər.

Koqnitiv Davranış Terapiyasının nəzəriyyəsində qeyd olunan bir məqam mövcud vəziyyəti izah etməkdədir. İnsanlar təxəyyüllərində canlandırdıqları hadisələrin sadəcə bir düşüncə olduğunun çox zaman fərqinə varmır və bu düşüncələri fəlakətləşdirirlər. Halbuki hadisənin həqiqətən başımıza gəlməsi, uzun müddət onun gerçəkləşə biləcəyi ilə bağlı narahatlıqlardan daha az zərərverici ola bilər (Kecmanovic, 2020).

Qeyri-müəyyən situasiyalarda insanların ən çox üz tutduqları psixoloji təsir mənbələrindən biri də mediadır. Vuhanda insanlar arasında yeni koronavirus infeksiyası başlayandan sonra, qlobal olaraq psixoloji sağlamlıq problemləri ilə bağlı bir çox yeni məlumatlar ortaya çıxdı və bununla birlikdə təşviş və stress də artdı. Qlobal media, yerli və beynəlxalq səhiyyə quruluşları, epidemioloqlar, virusoloqlar COVID-19-un yayılması və ölümlər haqqında məlumat verir, tövsiyələr və yeniləmələr edirlər. Lakin COVID-19-un psixoloji təsirinə laqeyd yanaşılmaqdadır. Belə ki, insanlar hər gün yenilənən yeni yoluxan sayını ölənlərin sayı ilə qarışdırır. Hansı ki bu say ölənlərin sadəcə 3%-ni təşkil edir. Prospektiv tədqiqatlar təhlükəli bir hadisə və sonra hadisəyə verilən stress reaksiyalarının zamanla fiziki və psixoloji sağlamlıq problemlərinə səbəb olduğunu göstərmişdir. COVID-19-un ortaya çıxması, qarışıq, mütəmadi olaraq dəyişən bir vəziyyəti ortaya qoydu. Səhiyyə müəssisələrində yer olmaması qorxusu, qida çatışmazlığı yaşamaq qorxusu və hər an yoluxmaq qorxusu və s. düşüncələr əhəmiyyətli psixoloji təsirləri ortaya çıxartdı. Media isə mütəmadi olaraq baş verənləri, karantinin tətbiq qaydalarını paylaşdığından bunlara müvafiq olaraq təşviş də artmışdır. Pandemiya dövründə cəmiyyətlər, medianın verdiyi informasiyanın aktual və doğru olduğuna inandığından, bu kimi qeyri-müəyyən hallarda sosial media asılılığı artır. Keçirilən tədqiqatlar məlumatların kütləvi informasiya vasitələri ilə ictimaiyyətə effektiv şəkildə çatdırıldıqda, insanların risk haqqında təsəvvürlərinin daha doğru şəkildə formalaşdığını göstərir. İnformasiya çatışmazlığı qeyri-müəyyənliyi və informasiya çirkliliyi, şaiyə xarakterli yazıların ortaya çıxması riskini artırır. Bəzi cəmiyyətlərdə, xəstəliyə yoluxanların sayında artış müşahidə olunmadığı halda təcili tibbi yardıma başvuranların sayı əvvəlki epidemiya dövrlərindəki kimi artmışdır.

İnsanların etibar etdikləri qurumlar tərəfindən qeyri-kafi məlumatlandırılması, təhrif olunmuş və informasiya çirkliliyi yaradan media quruluşlarının işinin məhdudlaşdırılmaması, qeyri-müəyyənliyə və artan narahatlığa səbəb olmaqdadır. Bu quruluşların uyğun olmayan fəaliyyəti gələcəkdə bəzi etnik qruplara qarşı stiqmatizasiya təhlükəsini də artırır. Pandemiyanın qarşısının alınması təkcə fərdi deyil, ümumi məsuliyyət tələb edir. İnsanların və səhiyyə işçilərinin ruhi sağlamlığının qorunması ilə bağlı tədbirlər də psixoloji sağlamlıqla bağlı sahələrdə çalışan insanların öhtəsinə düşür (Kaya, 2020).

İnsanlar üçün ən dözülməz olan qeyri-müəyyənlikdir. Qeyri-müəyyənlik insanlarda idarənin itirilməsi hissinə səbəb olur ki, bu da narahat və depressiv bir ruh halına gətirib çıxarır. Bunun qarşısını almaq üçün bir sıra strategiyalardan istifadə edilə bilər:

1. Hiss etmək; daxildə ortaya çıxan narahat edici hissin bədənimizin hansı hissəsində olduğunu başa düşmək. Məsələn: çiyin, kürək, qarın və s.
2. Adlandırmaq; etməli olduğumuz, mühakimə edici ifadələrdən istifadə etmədən yaşadığımız hissi adlandırmaqdır. Özümüzü narahat hiss etdikdə beynimizin əlaqəli hissələri aktivləşir və bu da paradoksal olaraq faydasız və avtomatik reaksiyalar göstərməyimizə səbəb olur. Mövcud təcrübəni adlandırdıqda, bu avtomatik cavab dayandırılır və daha məntiqli, doğru reaksiyalar verə bilirik.
3. Özünüzə zaman ayırın; Qeyri-müəyyənliyi təcrübədən keçirmək üçün özümüzə zaman ayıranda, problemi nəzarət altında tutmaq istəyi də avtomatik olaraq azalır. Qeyri-müəyyənlikdən qurtulmaq üçün sərf edəcəyimiz enerji də özümüzə qalır. Bu səbəbdən də müəyyən bir səviyyəyə qədər hiss etdiyimiz diskomfortun normal olduğunu özümüzə xatırlatmalıyıq.
4. Suallara cavab tapmağa çalışmamalıyıq; Ağlımızdakı suallara "bu sualın cavabını bilmirəm" deyə qarşılıq vermək vacibdir. Çünkü həqiqətən nə olacağını bilmirik və nəzarətimiz altında olmayan problemləri düşünməyə vaxt və enerji sərf etmək problem həllinə yönəlmiş terapiyada qəbul edilməzdir.
5. Nəfəs hərəkətləri; Qısa və yavaş nəfəslər alıb vermək zehindəki bulanıqlığın azalmasına kömək edir.
6. Özünüzə mərhəmətlə yanaşın; yaşadığınız bu narahat edici və qeyri-müəyyən vəziyyət üzərində nəzarətinizin mümkün olmadığını özünüzə xatırladın.
7. Problemi düşünmək saatı; Sözsüz ki, "mən daha bunu düşünməyəcəm" deməklə nəinki bizi narahat edən məsələni düşünməyimiz azalmır, əksinə onu daha çox düşünməyə başlayırıq. Bu səbəblə də, gün ərzində müəyyən etdiyimiz hər hansı bir saatda 10 dəqiqə müddətində mövcud problemimizi intensiv düşünmək, o saata qədər onu düşünməyi ertələmək praktikada istifadə olunan işə yarayan metodikalardan biridir.

Psixoloji sağlamlığı qorumaq üçün edilə biləcək ən doğru şey, problemin nə olduğunu əlimizdən gəldiyi qədər başa düşdükdən sonra, görülə biləcək tədbirləri görərək vəziyyətə real yanaşmaqdır. Bu müddətdə ortaya çıxa biləcək təşviş və narahatlığın müəyyən bir səviyyəyə qədər normal olduğunu anlayaraq, bu hisslər ilə başa çıxmaq üçün yardımçı ola biləcək strategiyalardan istifadə etməyimiz vacibdir. Həm fizioloji, həm psixoloji sağlamlığımızı qorumaq üçün öyrəşdiklərimizdən fərqli vasitələrdən istifadə edə bilməliyik. Bütün bunlar kifayət etmirsə psixoloji yardım almaqda heç bir qəbahət yoxdur.

## Nəticə

Kütləvi təsirə malik yoluxucu xəstəliklər, adətən cəmiyyətdəki bir çox insanın davranışında və psixoloji rifahında gözlə görüləcək dərəcədə pozuntulara yol açır, qorxu və narahatlığa səbəb olur. Pandemiyanın psixoloji təsirləri ilə ilə bağlı olaraq təşviş pozuntuları və stress, sağlamlıqla bağlı təşviş, depressiya travma sonrası stress və intihar hallarına rast gəlinir. Ortaya çıxan əlamətlər fərdin, cəmiyyətin xüsusiyyətlərinə, sosial vəziyyətinə görə bir-birindən fərqlənirlər. Narahat hiss etməyə və təşviş əlamətlərinin ortaya çıxmasına səbəb olan COVID-19 ilə bağlı xəbərlərə baxmağı, oxumağı minimal həddə qədər azaltmaq və sadəcə güvənilə biləcək mənbələrdən informasiya əldə etmək fərdin özü və sevdiklərinin psixoloji sağlamlığı üçün vacibdir. Əvvəlki araşdırmalar, qlobal xəstəliklərin və hadisələrin insanların fiziki və psixoloji sağlamlığında qalıcı problemlərə yol aça bildiyini göstərmişdir. COVID-19-un başlanması ilə müşahidə olunan psixoloji problemlərlə bağlı ölkə səviyyəsində planlaşdırma və yardım sistemləri cəmiyyətin üzərindəki psixoloji təzyiq və psixoloji sağlamlıqla bağlı problemlərin qarşısını ala bilər. Mövcud vəziyyətlə bağlı yerli ədəbiyyatların və araşdırmaların azlığı, psixoloji yardımın yetərsizliyi də diqqəti çəkməkdədir.

## Ədəbiyyat

1. Akhanlı, E.S. (2019). *Bilişsel çelişki kuramı kapsamında replikasyon çalışması* (Master's thesis, Başkent Üniversitesi Sosyal Bilimler Enstitüsü).
2. Aydemir, Ö., Kırpınar, İ., Satı, T., Uykur, B. ve Cengisiz, C. (2013) Sağlık Anksiyetesi Ölçeği'nin Türkçe için Güvenilirlik ve Geçerlilik Çalışması. Nöropsikiyatri Arşivi, 50(4), 325-331.
3. BİÇER, İ., ÇAKMAK, C., DEMİR, H., & KURT, M.E. Koronavirüs Anksiyete Ölçeği Kısa Formu: Türkçe Geçerlik ve Güvenirlik Çalışması. *Anadolu Kliniği Tıp Bilimleri Dergisi*, *25* (Supplement 1), 216-225.
4. Brooks, S.K., Webster, R.K., Smith, L.E., Woodland, L., Wessely, S., Greenberg, N., & Rubin, G.J. (2020). The psychological impact of quarantine and how to reduce it: Rapid review of the evidence. The Lancet, 395(10227), 912–920.
5. Forbes, M.K., & Krueger, R.F. (2019). The Great Recession and Mental Health in the United States. Clinical Psychological Science, 7(5), 900–913.

6. Kaya, B. (2020). Pandeminin ruh sağlığına etkileri.
7. Kecmanovic, J. (2020). 7 Science-Based Strategies to Cope with Coronovirus Anxiety. Retrieved from: theconversation.com/7-science-based-strategies-to-cope-with-coronavirus-anxiety-133207.
8. Kocaman, N. (2008). HASTALARIN PSİKOSOSYAL TEPKİLERİNİ ETKİLEYEN FAKTÖRLER. *Anadolu Hemşirelik ve Sağlık Bilimleri Dergisi*, *11*(1), 101-112.
9. Kömürcü, B., Gör, N. (2016). Erken dönem uyumsuz şemalar ve kaygı üzerine bir derleme. *Nesne Psikoloji Dergisi*, *4*(8), 183-203.
10. Nelson, B.W., Pettitt, A.K., Flannery, J., & Allen, N.B. (2020, April 13). Rapid Assessment of Psychological and Epidemiological Correlates of COVID-19 Concern, Financial Strain, and Health-Related Behavior Change in a Large Online Sample.
11. Lee, D.H., Kim, J.Y., & Kang, H.S. (2016). The emotional distress and fear of contagion related to Middle East Respiratory Syndrome (MERS) on general public in Korea. Korean J Psychol Gen, 35(2), 355-383.
12. Tutku, E.K. İ.Z., ILIMAN, E., & DÖNMEZ, E. (2020). Bireylerin Sağlik Anksiyetesi Düzeyleri İle Covid-19 Salgini Kontrol Algisinin Karşilaştirilmasi. *Uluslararası Sağlık Yönetimi ve Stratejileri Araştırma Dergisi*, *6* (1), 139-154.
13. Wilson, D. (2008). Psychological Trauma and Its Treatment in the Polio Epidemics. Bulletin of the History of Medicine, 82 (4), 848–877.
14. Yu, H. Y. R., Ho, S. C., So, K. F. E., & Lo, Y. L. (2005). The psychological burden experienced by Hong Kong midlife women during the SARS epidemic. Stress and Health, 21(3), 177–184.

## COVID-19 and features of psychological health

**Summary**

Massive communicable diseases, often cause visible disturbances in the behavior and psychological well being of many people in society, causing fear and anxiety. Anxiety disorders and stress, health anxiety, post traumatic stress and suicide are associated with the psychological effects of the pandemic. The resulting symptoms differ according to the characteristics of the individual, society and social status. It is important for the psychological health the individual and their loved ones, to minimize to look at COVID-19 news, reading, which causes anxiety and anxiety symptoms and to obtain information only from reliable sources. Previous research has shown that global diseases and events can cause lasting problems in people's physical and psychological health. Nationwide planning and assistance systems for the psychological problems can prevent psychological pressure on society and psychological health problems. The lack of local literature and research on the current situation and the lack of psychological assistance are also noteworthy.

## COVID-19 и особенности психологического здоровья

**Резюме**

Массовое и прогрессирующее распространение инфекционных заболеваний часто вызывают видимые нарушения в поведении и психологическом благополучии многих людей в обществе вызывая страх и беспокойство. Среди психологических последствий пандемии встречаются тревожные расстройства и стресс, чрезмерное беспокойство о здоровье, посттравматический стресс и суициды. В результате проявляющиеся симптомы различаются в зависимости от индивидуальных особенностей личности, общества и социального статуса. Для психологического здоровья человека и его близких важно минимизация просмотра, чтение новостей и получение информации только из надежных источников про COVID-19, которые вызывают беспокойство, появление признаков тревоги. Предыдущие исследования показали, что глобальные заболевания и события могут привести к постоянным проблемам в физическом и психологическом здоровье людей. Системы планирования и помощи на уровне страны могут предотвратить психологическое давление на общество и проблемы психологического здоровья, которые вызваны COVID-19. В связи с текущей ситуацией наблюдается нехватка отечественной литературы и исследований, а также отсутствие психологической помощи.

Göndərilib: 16.06.2020 Qəbul edilib: 17.06.2020

**PEDAQOGİKA PEDAGOGY ПЕДАГОГИКА**

DOI: 10.36719/AEM/2007-2020/55/138-141

**Ziba İlham qızı Kərimzadə**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
kerimzadehz@gmail.com

# KİÇİK YAŞLI UŞAQLARDA LÜĞƏT EHTİYATININ İNKİŞAFI

***Açar sözlər:*** *nitq, lüğət ehtiyatı, inkişaf, yeni anlayış, söz,ünsiyyət*
***Key words:*** *speech, vocabulary, development, new concept, word, communication*
***Ключевые слова:*** *речь, словарный запас, развитие, новые понятия, слова, общение*

Uşaqlarda aydın və səlist nitqin inkişafında lüğət ehtiyatının zənginləşdirilməsi mərkəzi yer tutur. Uşağın lüğət ehtiyatının məzmunu və xüsusiyyəti onun təfəkkür və nitqinin inkişafını müəyyən edir. Kiçik yaşlı uşaqlarda lüğətin formalaşması öncə əşyalarla tanışlıqdan başlanır. Onlar fəaliyyətin bütün sahələrində ətraf aləmdəki əşya və hadisələri bilavasitə müşahidə aparmalı olurlar. Y.M.Tixeyeva nitq inkişafında müşahidənin rolunu yüksək qiymətləndirir.“Əgər siz uşağın nitqinin inkişaf etməsinə çalışırsınızsa, onu əşyalarla əhatə edin. Bu əşyalara uşaqla birlikdə baxın, müqayisə edin, onları oyun və əmək prosesində öyrənin və müşahidənin nəticəsini sözlə ifadə edin. Quru divarlar içərisində uşaq danışmağı öyrənməz.” (Тихеева, 1932: 123)

Uşaq hər dəfə yeni obyektlə qarşılaşarkən idraki müşahidə aparır. O, yeni əşyaya əl vurur, onu izləyir, imkan daxilində dadına baxır, səsini yada salmağa çalışır.Uşaq əşya və hadisənin mahiyyətini, xassə və əlamətlərini öyrənir. Bu prosesdə uşağın görmə, eşitmə, iyibilmə, dadbilmə, lamisə, kinestetik analizatorları fəallaşır, duyğuları, hissləri inkişaf edir. Müşahidə zamanı uşaq obyekti ona bənzər digər obyektlərlə tutuşdurur, müqayisə edir, hadisələrin adını başlıca əlamətlərini, xassələrini ayırır, obyekt haqqında mühakimə edir, əşyanın əlamətini və xassələrini öyrənir. Müşahidə uşağı varlığı dərindən, əhatəli başa düşməyə, onunla söz arasında düzgün münasibətləri müəyyənləşdirməyə yönəldir.

Kiçik yaşlı uşaqlarda lüğətin inkişafını şərt olaraq bir neçə mərhələyə ayırmaq olar:

I. Lüğət ehtiyatının ilkin: passiv inkişaf mərhələsi (1- 1,5 yaşına qədər)

II. Lüğət ehtiyatının aktiv inkişafı mərhələsi (1,5 -3,5 yaş)

Üç-dörd yaşlı uşaqlarla lüğətin inkişafı süjetli oyunlar sayəsində inkişaf edir. Oyun fəaliyyəti və yaşlılarla ünsiyyət prosesində onların öyrəndikləri sözlər dəqiqləşir və fəallaşır. Beş-altı yaşlı uşaqlarla aparılan oyunlarla yanaşı, onların məişət fəaliyyəti, gəzintilər və s. də lüğətin zənginləşməsinə gətirib çıxarır. Onlarda əşya və hadisələrin xüsusiyyətləri, təyinatı haqqında biliklərini dərinləşdirir. Beləliklə də, uşağı əhatə edən ətraf aləmdə hər hansı canlı ya cansız əşya, müntəzəm təmasda olduğu əşya və hadisələr, onun diqqətini cəlb edən oyun və əyləncələr lüğətin yeni sözlər hesabına zənginləşməsinə səbəb olur .

Kiçik yaşlı uşaqlarda lüğətin zənginləşdirilməsi üzərində işi normal təşkilini təmin etmək üçün ilk növbədə onun linqvistik, psixoloji əsasını bilmək vacibdir. Uşağın idrak obyekti olan söz bir tərəfdən leksik digər tərəfdən qrammatik mənaya malikdir. Sözün leksik mənası əşya və hadisələri ifadə etmək qabiliyyətini bildirir.

Lüğətin zənginləşdirilməsi fikrin məzmununun zənginləşdirilməsi ilə sıx əlaqədardır. Fikrimizi bildirmək üçün sözlərdən istifadə edirik. Əgər fikrimiz aydın deyilsə, təbii ki, nitqimiz də anlaşılmaz olacaqdır. Uşağın lüğət ehtiyatının məzmunu və xüsusiyyəti onun təfəkkür və nitqinin inkişafını müəyyən edir. Lüğətin formalaşması üzrə işə əşya ilə tanışlıqdan başlanır. Uşağı əhatə edən ətraf aləmdə hər hansı canlı ya cansız varlıq, onun diqqətini cəlb edən, müntəzəm təmasda olduğu əşya və hadisələr, oyunlar və ɔ ylənсələr lüğətinin yeni sözlər hesabına zənginləşməsinə səbəb olur. Uşaqlar fəaliyyətinin bütün sahələrində ətraf aləmin əşya və hadisələri üzərində bilavasitə müşahidə aparmalı olurlar.Uşağın diqqəti hər hansı əşya və ya hadisəyɔ yönəldikdə, onunla maraqlandıqda adını öyrətmək lazımdır. Müvafiq söz onların fəal lüğətində möhkəmləndirilir.

Həyatın üçüncü ilində uşaqlara xüsusi nitq tapşırıqları verilə bilər. Daha sadə olaraq-böyüklər bir sözü düzgün tələffüz etməyi , sözü təkrarlamağı tapşırmalıdır. Daha mürəkkəbləşdirib, məsələn: "Nənənizin yanına gedin və ona deyin:" Nənə, xahiş edirəm mənə papağımı ver” tipli tapşırıq vermək olar.

Bu cür tapşırıqlar sayəsində həm nitqin, inkişafı həm də lüğətin inkişafı üçün faydalı hesab olunur. Birincisi, yalnız nitqin qrammatik, leksik düzgünlüyünün formalaşmasına kömək etmir, həm də ünsiyyət

mədəniyyətini inkişaf etdirir. İkincisi, çünki uşaq şüurlu şəkildə nitqini qurmağı, başqalarının necə danışdığını, yeni sözlər tanımağı öyrənir.

Lüğət ehtiyatının zənginləşdirilməsi zamanı uşaqlara sual verməyi öyrətmək yaxşı kömək edir: "Nə üçün?", "Nədir?", "Hansı?", "Harada?" və s. Məsələn, uşağa müəyyən tipli tapşırıqlar verilməlidir. Ya uşaqlara mövzu üzrə suallar verilməlidir, ya da uşaqdan həmin sual cümlələrini qurmaq tapşırılmalıdır.

Uşaqlara təkcə mövzu şəkilləri (məsələn, ayrı-ayrı heyvanların, əşyaların şəkilləri), həm də bəzi hadisələri (oğlan kitab oxuyur, uşaqlar quşu qəfəsdən çıxarır) təsvir edən şəkillər göstərilə bilər. Üçüncü ildə uşaqların şəkillərə baxma imkanları artır, bir yetkin rəhbərliyi ilə lüğəti inkişaf edir. Təsvirin mənası izah olunur, hərəkətlərin ardıcıllığı ortaya qoyulur, uşaqlara suallar verilir və s.

Uşaqların lüğət ehtiyatını zənginləşdirmək, sadə cümlələri düzgün tərtib etmək bacarıqlarının formalaşması üçün geniş imkanlar var. Uşaq rəngləndiyi şəkilə baxaraq sualları cavablandırarkən, qızın paltarını, paltarın rəngini, ayaqqabının rənglərini və s. adlandırırsa, həmin təsvirə əlavələr olunursa sual və cavablar çoxalır.

Uşaqlarla bədii ədəbiyyat nümunələrinin (hekayə, şeir, nağıl) oxusu prosesində, atalar sözləri, tapmacalarla iş zamanı onların lüğət ehtiyatı zənginləşir. Uşaqları yeni söz, fikirlər ilə tanış etmək üçün vacibdir. Ancaq eyni zamanda, düzgün səs tələffüzü də inkişaf etdirilməlidir.

Onların fəal lüğət ehtiyatı məişət lüğətindən ibarət olur. Qeyri-fəal lüğət ehtiyatında isə çoxlu peşələrlə bağlı sözlər, terminlər, dialektizmlər, neologizmlər, arxaizmlər olur. Bu sözlərdən istədikləri vaxt istifadə etməyə çalışırlar. Böyüklər vaxtaşırı elə nitq situasiyası yaratmalıdır ki, uşaqlar həmin sözlərdən istifadə etmək məcburiyyətində qalsınlar. Uşaqların lüğət ehtiyatının xüsusiyyətlərini dəqiq öyrənmək, onların hamısı üçün ortaq sözləri seçmək çox çətindir, çünki uşaqlar müxtəlif məişət və nitq mühitində yaşayırlar. Belə şəraitdə şagirdlərin nitqindəki fərqlər oxşarlıqdan daha çox olur. Bunlardan başqa onların nitqinin çevik və dəyişkən olması buna imkan vermir. Deməli, tərbiyəçi uşaqların lüğət ehtiyatının xüsusiyyətlərini təxmini öyrənə bilir.

Uşağın lüğət ehtiyatını öyrənərkən onun həcmini və tərkibini müəyyənləşdirməklə yanaşı, hər bir sözün uşaqlar tərəfindən işlənməsi xüsusiyyətləri də öyrənilməlidir. Uşaqların lüğət ehtiyatının xüsusiyyətlərinin öyrənilməsi dedikdə, ilk növbədə onların fəal lüğətində olan sözləri öyrənmək nəzərdə tutulur. Müəllim və ya valideyn uşağın lüğətindəki əşya adı, keyfiyyət, əlamət, hərəkət bildirən sözləri, onların dəqiq mənada işlədilməsi qaydasını, cins və növ anlayışları ifadə etmək bacarıqlarını onlara çatdırmalıdır. Uşağın sözlərin mənası ilə maraqlanması, hər bir əşya və hadisənin adını öyrənib, yadda saxlaması çox maraqlı və ciddi məsələdir. Bu baxımdan uşağın dil açdığı dövrdən onun nitqi üzərində daim müşahidə aparmaq, sözlərin mənalarını necə öyrənməsi və fəal lüğətə necə daxil etməsi prosesini izləmək vacibdir.

Valideynlər uşağın müxtəlif əşyalar və hadisələr ilə tanış olmaq istədiyi bir mühit təşkil etməlidirlər. Valideynlər uşağının təbii müəllimləridir və çox şey onlardan asılıdır. Valideynlər daim obyektləri və hərəkətləri çox sadə sözlərlə deməli və onlara tez-tez təkrarlatmağa çalışmalıdırlar:

- Oyuncaqları, geyimləri, yeməklərin adını deyərək uşağın söz ehtiyatını tədricən genişləndirmək lazımdır;
- Uşaqlara həm də müstəqil olmaq imkanı verilməlidir. Məsuliyyət hissini inkişaf etdirmək, uşağın böyüməsinə kömək etmək və yeni sözlərin özünün kəşf etməsinə imkanı yaratmaq çox vacibdir.
- Uşaq nə qədər danışmaq məcburiyyətində qalırsa, buna qarşı çıxma riski o qədər çox olur;
- Uşaqla daim "uşaq dilində" danışmaq. Bu, onu danışmağa təşviq etməyəcək, çünki bu nitq inkişafının növbəti mərhələsinə keçməyə imkan vermir;

Növ və cins münasibətləri yalnız sadə məişət anlayışları dairəsində misallar əsasında başa salınmalıdır. Bu zaman növ anlayışlarında əşyanın ən əhəmiyyətli, həm də xarici xüsusiyyətləri (hissələri, forması, böyüklüyü, rəngi və s.) nəzərə alınmalıdır: məsələn, alma, banan ilk növbədə formalarına görə fərqlənir. Cins anlayışı üçün isə həm xarici, həm digər əlamətlər mühüm sayılır məsələn, tərəvəz və meyvə anlayışları bitkinin onun məhsulunun formasına harada bitməsinə, hansı hissəsinin yeyilməsinə, harada və necə istifadə olunmasına görə fərqlənir.

Uşaqlarda yeni anlayışlar möhkəmləndirilir.Kiçik yaşlı uşaqların lüğətinin genişləndirilməsi üzrə iş yalnız bir istiqamətdə deyil, müxtəlif istiqamətlərdə də aparılır. Uşaq geyinərkən, qidalanarkən, ev işlərində anasına kömək edərkən, televiziya verilişinə baxarkən, oynayarkən onun lüğətinin zəngin ləşdirilməsi üçün geniş imkanlar açılır. Bu prosesdə o, çoxlu suallar verir, əşya və hadisələrlə bilavasitə təmasda olduğunundan hər şeylə maraqlanır, iş prosesinin ayrı ayrı mərhələlərini adlandırmağa çalışır.

4 - 5 yaş lüğətin inkişafı üçün xüsusi əhəmiyyət kəsb edir. Bədii ədəbiyyat nitqin, söz ehtiyatının artırılmasında mühüm rol oynayır. Kitabdan uşaq bir çox yeni sözlər öyrənir, nitqi emosional və zəngin olur. Aktiv lüğətdə artım (ilin sonuna 2500-dən 3000 sözə qədər) verir.Uşağa öz ifadələrini daha dolğun və dəqiq ifadə

